Surxondaryo viloyati oʻzbek marosim folklorining janrlar tizimida alohida oʻrin tutadigan beshik toʻyi marosimi folklori ham bir qator xususiyatlari bilan boshqa vohalardagi ayni marosimiy jarayondan jiddiy farqlanuvchi belgilarga ega. Surxon vohasi aholisi marosim folklorining janrlar tarkibi umumoʻzbek folklori an'analari bilan mushtarak jihatlarga ega boʻlsa-da, ammo ana shu marosimlar ichidagi turli-tuman urf-odat, rasmrusum, irim-sirim, aytim va alomatlar talqinidagi oʻziga xosliklari bilan boshqa hududlardan jiddiy farqlanib turadi. Bunday oʻzgachalik vohada qadimdan shakllangan oʻziga xos folklor an'analari, viloyat aholisining etnik tarkibi bilan bogʻliq janriy rang-baranglik va hududda kechgan koʻp asrlik madaniy jarayonlar natijasida yuzaga kelgan badiiy matnlarning boshqa joylarda uchramasligi yoki muayyan darajada farqlanib turishi bilan xarakterlanadi.

## Adabiyotlar


1. Qarang: Troitskaya A.L. Pervыe sorok dney rebenka (chillya) sredi osedlogo naseleniya Tashkentskogo i CHimkentskogo uezdov // V.V.Bartoldu – druzya, ucheniki i pochitateli. – T., 1927; YAna oʻsha. Rojdenie i pervыe godы jizni rebenka u tadjikov dolinы Zerafshana //Sovetskaya etnografiya. – 1935. - № 6; YAna oʻsha. Nekotorыe starinnыe obычai, obryadы i poverya tadjikov dolinы Verxnego Zerafshana //Trudы Instituta etnografii. T. XCVII. – M., 1971; Snesarev G. P. Reliktы domusulmanskix verovaniy i obryadov u uzbekov Xorezma. – M.: Nauka, 1969. – S.73-106; Firshteyn L.A. O nekotorыx obычayax i poveryax, svyazannыx s rojdeniem i vospitaniem rebenka u uzbekov YUjnogo Xorezma //Semya i semeynыe obryadы u narodov Sredney Azii i Kazaxstana. – M.: Nauka, 1978. – S.189-208; Safarov O. Bolalarni erkalovchi oʻzbek xalq qoʻshiqlari. – Toshkent: Fan, 1983; Qurbonova N. Oʻzbek bolalar marosim folklori: Filol. fanlari nomz. diss. avtoref. – Toshkent, 1994; Quronboeva N. Xorazm toʻy marosim folklori: filol.fanlari nomz. diss. avtoref. – T., 1998; Hamroqulova B.Surxondaryo viloyatida bolalar bilan bogʻliq urfodatlar: Tarix fanlari nomz. diss. – Toshkent, 2001.
2. Safarov O. Oʻzbek bolalar poetik folklori. – Toshkent: Oʻqituvchi, 1985. – B. 46.
3. Boychechak. Bolalar folklori. Mehnat qoʻshiqlari. Oʻzbek xalq ijodi. – Toshkent: Adabiyot va san'at, 1984. – B. 52.
4. OʻzR FA Alisher Navoiy nomidagi Til va adabiyot instituti. Folklor arxivi. Inv. - № 1833. – B. 2-3.
5. Musaqulov A. Oʻzbek xalq lirikasi. – Toshkent: Fan, 1995; Roʻzimboev S. Qoʻshiqlarda soch magiyasi //Roʻzimboev S., Sobirova N. «Avesto» mifologiyasi va Xorazm folklori. – Urganch, 2001. – B.18-19.
6. Firshteyn L.A. O nekotorыx obычayax i poveryax, svyazannыx s rojdeniem i vospitaniem rebenka u uzbekov Xorezma //Semya i semeynыe obryadы u narodov Sredney Azii i Kazaxstana. – M.: Nauka, 1978. – S.200-203; Joʻraev M. Soch magiyasi va u bilan bogʻliq marosimlar //Oʻzbekiston etnologiyasi: yangicha qarashlar va yondashuvlar. – Toshkent, 2004. – B. 190-198.
7. OʻzR FA Alisher Navoiy nomidagi Til va adabiyot instituti Folklor arxivi. Inv. - №1833. – B. 22.
8. Mahmud Koshgʻariy. Devonu lugʻotit turk. T.1. – Toshkent: Fan, 1960. – B. 201-466.
9. Safarov A. Janrovыy sostav i poetika uzbekskogo detskogo poeticheskogo folklora: Avtoref. diss. … d-ra filol. nauk. – Tashkent, 1985; YAna oʻsha: Bolalarni erkalovchi oʻzbek xalq qoʻshiqlari. – Toshkent: Fan, 1983; YAna oʻsha. Oʻzbek bolalar poetik folklori. – Toshkent: Oʻqituvchi, 1985; YAna oʻsha. Alla-yo, alla. Toʻplab nashrga tayyorlovchi: O.Safarov. – T.: Oʻqituvchi, 1985; YAna oʻsha. Allayo-alla. Toʻplab, nashrga tayyorlovchi: O.Safarov. – Toshkent: Oʻqituvchi, 1999.
10. Qurbonova N. Oʻzbek bolalar marosim folklori: Filol.fanlari nomz. diss. avtoref. – Toshkent, 1994.
11. Davlatov S.X. Qashqadaryo vohasi oʻzbek toʻy marosimlari folklori: Filol. fanlari nomz. diss. avtoref. – Toshkent, 1996; Quronboeva N. Xorazm toʻy qoʻshiqlari: Filol. fanlari nomz. diss. avtoref. – Toshkent: 1998.
12. Roʻzmetov H. Xorazm bolalar folklori (lokal xususiyatlari, tasnifi va badiiyati): Filol. fan.nomz. diss. avtoref. – Toshkent, 2005. – B. 9.
13. Jahongirov Gʻ. Oʻzbek bolalar folklori. – Toshkent: Oʻqituvchi, 1975. – B. 64-88; YAkubbekova M. Janrovaya spetsifika i poeticheskie osobennosti uzbekskix narodnыx pesen «Alla»: Avtoref. diss. ... kand. filol. nauk. – Tashkent, 1990; YOqubbekova M. Oʻzbek xalq allalarida ruhiyat tasviri //Oʻzbek tili va adabiyoti. – Toshkent, 1990. – 2-son. – B. 49-51; YAna oʻsha. Beshiklar olib kelayin, alla. – Andijon, 1993; Alla, alla, oppogʻim. Toʻplab, nashrga tayyorlovchi: M.YOqubbekova. – Toshkent: Respublika oila ilmiy markazi, 2002; Alla aytay, jonim bolam. Toʻplovchi va nashrga tayyorlovchi: Mardonova G. – T.:F


Göndərilib: 27.08.2020 Qəbul edilib: 28.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/76-78

**Günay İsfəndiyar qızı Sadıqova**
Gəncə Dövlət Universiteti
sgi_bioloq@mail.ru
**Əmirəhməd Namiq oğlu Qasımov**
Gəncə Dövlət Universiteti

# TƏHSİLDƏ QİYMƏTLƏNDİRMƏNİN ROLU

**Xülasə**

Məqalənin məqsədi köhnə metodların maraqlı bir tərəfini tapmaq, yeniliklə yanaşı bu şəkildə tədris olunan dərslərin keyfiyyətini artırmaqdan ibarətdir. Bununla əlaqədar olaraq şagird nailiyyətlərinin qiymətləndirilməsi prosesinə aid məsələlərindən ən başlıcasını onun şəxsi keyfiyyətlərinin diaqnostik yolları və metodlarının işlənib hazırlanması təşkil edir. Məqalədə bu metodun orta məktəblərdə yaxşı nəticələr göstərdiyi də sübut olunur. Qiymətləndirmə həm universitet tələbələri, həm də orta məktəb şagirdləri üçün çox vacibdir. Çünki bəzən bir uşaq üçün müəllimin verdiyi aşağı qiymət onu dərslərdən tamamilə soyudub elmdən uzaqlaşdıra bilər.

***Açar sözlər**: tədris prosesi, yeni təlim texnologiyalarının tətbiqi, təhsilin keyfiyyəti, təlimin forması, təlimin metodları, müasir dərs*

## The role of assessment in education

**Summary**

The purpose of the article is to find an interesting aspect of old methods, along with innovation, is to improve the quality of the lessons taught in this way. Research in high schools and high schools has provided more monitoring opportunities. The article also proves that this method has shown good results in secondary schools. Grading is very important for both university students and secondary school students. Because sometimes a low teacher's assessment for a child can completely cool him off from classes and take him away from science.

***Key words**: teaching process, introduction of new learning technologies, quality of education, form of training, teaching methods, modern lesson*

## Giriş

Təhsil müəssələrində tədris prosesində yeni təlim texnologiyalarının tətbiqi, dünya təhsil sisteminə inteqrasiya məsələlərinə ciddi yanaşılır. Təhsilin keyfiyyəti tək şərt deyil, həm də prosesdir. Keyfiyyətli təhsil prosesinin əsas tərkib hissələrindən biri dərsin təşkilidir: onun mərhələləri, təlimin forma, üsul və metodlarıdır, onun qurulması optimal düzgün həllinin tapılmasıdır.

Müasir dərsdə müəllim hər bir uşağı görür, onun potensialından maksimum istifadə edir. Müasir dərs bütün iştirakçıların qarşılıqlı inam və etibarı əsasında canlı ünsiyyətdir. Dərs nəinki müəllimin, həm də şagirdin yaradıcılığının nəticəsi olur.

Fəal dərsin səmərəliyini artırmaq üçün ən mühüm şərtlərdən biri dərsin planlaşdırılmasıdır. Fəal dərsin yaradıcı xarakterinə baxmayaraq, onun uğuru dərsin bütün mərhələlərinin öncədən planlaşdırılmasından asılıdır.

Hər bir planlı qurulmuş dərs daha yüksək nəticəyə gətirib çıxarır. Çünki, müəllim öncədən dərsin necə başlayıb necə bitəcəyini öz təsəvvüründə canlandırmış olur. Beləliklədə dərs daha yüksək səviyyədə alınır ki, buda şagirdlərin dərsi tam qavramasına dəlalət edir.

## Material və metod

Respublikada hazırda islahatlar aparılır. Təhsilin maddi bazası, təhsil və tərbiyə işinin məzmununda, metodikasında, müəllim-şagird münasibətlərində, idarə etmədə böyük dəyişiklik baş verir. Azərbaycanda milli dövlət quruculuğunun başlanması ilə pedaqoji nəzəriyyə və praktikada əvvəllər bərqərar olmuş stereotiplərin köhnəldiyi dərk edildi. Yeni pedaqoji konsepsiyalar, nəzəriyyələr irəli sürüldü. Yeni pedaqoji təfəkkür, milli qaynaqlar və ümumbəşəri dəyərlər zəmində yaranan məktəbin inkişafında təsir edə biləcək konsepsiyalar, nəzəriyyələr meydana çıxdı. Şagirdin bir şəxsiyyət kimi formalaşması təhsil sisteminin əsas vəzifəsi hesab olunur. Bu köklü vəzifənin həyata keçirilməsi üçün təhsilin, təlimin inkişafetdirici, tərbiyəedici, diaqnostik funksiyaların genişlənməsi ön plana çəkildi. Pedaqogikanın metodoloji problemlərinə, strukturlarına dair yeni ideyalar, fikirlər, yanaşmalar formalaşdı. Bu dövrdə təlim və tərbiyə nəzəriyyəsində ciddi dəyişiklik baş verdi. İdeyalar dəyişdi. Elmi pedaqogikanın qarşısında duran ən aktual problemlərdən biri ahəngdar şəxsiyyətin formalaşması məsələsidir.

Respublikamızda müasir dövrdə sosial-iqtisadi proseslərin inkişaf istiqamətlərini xarakterizə edən başlıca xüsusiyyətlərdən biri də informasiyanın rolunun əhəmiyyətli surətdə artmasıdır. Təhsil sisteminin təlim-tərbiyə, idarəetmə, qiymətləndirmə və s. fəaliyyət növlərinin təkmilləşdirilməsində informasiyanın rolu böyükdür. Həmçinin təhsil sistemi inkişafın başlıca istiqamətlərini xarakterizə edir. Təhsil sistemində informasiyalardan istifadəyə kortəbii surətdə yanaşma yüksək səviyyədə subyektivliyə gətirir və informasiya cəmiyyətinin inkişaf tendensiyaları ilə ziddiyyət təşkil edir. Baxılan problemin həlli təhsil prosesinə müasir pedaqoji texnologiyaların tətbiqi nəticəsində mümkündür. Pedaqoji diaqnostikanı belə müasir texnologiyalara aid etmək olar. Şagirdlərin biliyinin inkişaf mərhələsinə müxtəlif faktorlardan bu və ya digər formada alimlər, tədqiqatçılar münasibət bildirmişlər. Rus tədqiqatçısı Uşinski yazmışdır ki, "Əgər pedaqogika insanı hərtərəfli tərbiyə etmək istəyirsə, onda hər şeydən əvvəl onu hərtərəfli öyrənməlidir". O, müəllimlərə məsləhət görmüşdür ki, şagirdlərinizi, onların ətraf mühitini, fiziki və daxili təbiətini nə qədər mümkündürsə çox öyrənsinlər.

Təlimdə vacib məsələlərdən biri də qiymətləndirmədir. Çünki hər bir müəllim tərəfindən verilən qiymət şagirdin həyatında böyük dönüş edə bilər. Hətda dərslərdə aktif olmayan şagirdə həvəsləndirici qiymət yazmaqla onun elmə marağını artırmaq olur. Elə bu baxımdanda ənənəvi üsulla müassir üsulu cəm edib dərslərə maraq yaratmaq olar.

Pedaqoji sistemin səmərəsi 100%-dən artıq ola bilməz. Bu göstəricinin 50%-i müəllimin, 50%-i isə şagirdin payına düşür. Buradan belə çıxır ki, ən pis pedaqoji prosesin nəticəsi 50%-dən aşağı ola bilməz. Həmin 50%-i bünövrə götürməklə hər zaman daha 50%, yəni 100%-ə çatmaq uğrunda mübarizə gedir. Lakin indiyədək tam 100%-lik qələbə əldə edilməmişdir. Ənənəvi pedaqoji sistemli iş əmsalı 60%-dir. Bu o deməkdir ki, məktəb yetirmələrinin yarıdan bir az çoxu proqram materiallarını mənimsəyə bilir. Odur ki, daha yüksək mənimsəmənin yolları axtarılır.

Yeni təlim texnologiyasının əsasının qoyulması, kompüter təliminin əsasında kompüterlərdən istifadə etməklə proqramlaşdırılmış təlimin dayanması "təlimin kompüter texnologiyası"nın artıq "informasiya texnologiyaları" ilə əvəz olunması diqqəti cəlb edirdi. Hətta yaş anlayışlarının yaranması – TYİT – təlimin yeni informasiya texnologiyaları yarandı. Kommunikativ texnologiyalar (KT) hətta cəmiyyətin "infortmalaşdırılması", "informasiya cəmiyyəti" anlayışlarının geniş yayılmağa başlanması ilə səciyyələnirdi. Keçmiş SSRİ-də təlim texnologiyasını təkmilləşdirən, ona yenilik gətirən novator müəllimlər, məktəb direktorları var idi. Bu sıradan Gürcüstanda Ş.Amanaşvilinin, Azərbaycanda Z.Şoyubovun, Rusiyada F.V.Şataların və daha bir neçə müəllimi qeyd etmək olar. Bunların arasında Şatalov daha çox diqqəti cəlb edir. Onun işlədiyi təlim texnologiyalarını "Şatalov metodu" adlandırırlar. Onun təlim texnologiyasının əsasına qrup (sinif) təlimi şəraitindən şagirdlərin mürəkkəb idrak fəaliyyətinin qurulması təşkil edirdi.

Tədqiqatlar göstərir ki, bütün mövzular üçün eyni metod və ya forma uyğun gələ bilməz. Ona görə də müəllimlər hər bir konkret mövzuya uyğun səmərəli təlim strategiyası axtarıb tapmalıdır. Biologiyanın tədrisində yüksək səmərəyə nail olmağın birinci şərti mövzunun məzmunundan asılı olaraq əyanilik prinsipinə əməl edilməsidir. Əyanilik prinsipinin əsasında dayanan bir sıra qanunauyğunluqların nəzərə alınması tədris prosesinin təşkilində mühüm əhəmiyyət daşıyır. Dünya təcrübəsindən istifadə edərək biologiyanın tədrisində səmərəliliyin yüksəldilməsi, ən yeni təlim texnologiyalarının təlimdə tətbiqi artıq beynəlxalq miqyasda öz səmərəsini təsdiqləmişdir.

## Analiz

Apardığımız araşdırmalarda, keçirdiyimiz sorğulardan məlum oldu ki, keçmiş vaxtlarda da müəllimlər dərslərdə maraq yartamaq üçün dərslərin yaddaqalan kecməsi üçün çox calışıblar. Belə ki, 1970-80 ci illərdə müəllimlər uşaqlar yaxşı cavab verəndə dərsə tam hazırlıqlı gələndə onların qiymət kitabcasına ulduz işarəli yapışqanlı kağız kəsimlər yapışdırırdılar. Amma əsas maraqlısı da odur ki, ulduz alan şagir hansısa dərslərin birində yaxşı cavab verməyəndə ulduzu müəllim qiymət kitabasından qoparıb bu üsulla ona cəza verirdi. Birdə məhs həmin uşaq ulduzu geri qaytarsın deyə daha əzimlə calışıb müəllimdən razılıq alırdı. Beləliklə də bütün sinif ulduzlar üçün yarışırdı, onların təhsil aldıqları məktəb isə məktəblər sırasında qalib seçilirdi.

Bu üsul bizdə maraq yarartdığından bu üsulu pedaqoji təcrübə üçün getdiyimiz orta məktəblərdə tədbiq etmək qərarına gəldik. Bunun üçün müəllimlərin ən zəf sinif adlandırdıqları sinifi seçərək orada işə başladıq düz üc ay bu üsulu istifadə etdik və nəticə inanılmaz oldu. Dərslərə çox zaman hazırlıqlı gəlməyən şagirdlər nəyinki gündəlik cavablarında müsbətə doöru dəyışdilər, hətda biologiya aid təcrübələrin işlənməsində oki var kömək etdilər.




Histoqramdan göründüyü kimi, davamlı istifadə olunan yeni hesab edilən lakin cox uzun illər öncə tədbiq olunan bu usül tədrisin səviyyəsini yüksəldərək, dərslərə xüsusi maraq yaratmışdır. Biz o məktəbdən uzaqlaşandan sonra bu üsulun orada tədbiqinin dayandırılması nəticənin aşağı olmasına gətirib cıxarıb.

## Nəticə və təkliflər

Eksperimentlər ali və orta məktəbləri əhatə etdiyindən müntəzəm olaraq onların səmərəlilik göstəricilərini müqayisəli öyrənilmişdir. Müəyyən olunmuşdur ki, bu üsul məktəblərdə maraq yaratmaqla təhsilin keyfiyyətinə təsir edir. Bu səbəbdəndir ki, müassir üsullarla yanaşı araşdırma apararaq köhnə üsulu cəmləşdirib hər ikisinin müsbət olan xususiyyətini seçərək şagird və tələbələrin elmə marağını artırmaq olar.

Qiymətləndirmə hər bir şagird və tələbələrin həyatında mühüm rol oynayır. Ona görə də hər bir müəllim qiymətləndirmə zamanı çox diqqətli olmalıdır. Çünki verilən hər hansı bir aşağı qiymət o şagird və tələbənin həyatını tamamilə dəyişə bilər.

Şagird nailiyyətlərinin qiymətləndirilməsi ənənəvi olaraq onların əldə etdikləri bilik, bacarıq və dəyərlərin kəmiyyətcə qiymətləndirilməsinə əsaslanır. Lakin şagirdlərin təlimin nəticələrini müəyyən edən şəxsi keyfiyyətlərinin qiymətləndirilməsi sistemi mövcud deyildir. Daha təəccüblüsü budur ki, təlimin məqsədlərini əks etdirən sənədlərin hamısında təlim-tərbiyə prosesində formalaşmalı olan müxtəlif şəxsi keyfiyyətlərdən bəhs olunur. Ola bilsin bu onunla əlaqədardır ki, şəxsi keyfiyyətlərin kəmiyyətcə qiymətləndirilməsi praktiki olaraq həyata keçirilməsi çətin olan bir məsələdir. Buna baxmayaraq, ancaq şəxsi keyfiyyətlərin qiymətləndirilməsi təlim prosesinin yekunları haqqında tam təsəvvür yaratmağa imkan verə bilər. Bu sahədə məktəbdə psixoloji xidmətin üzərinə mühüm vəzifələr düşür.

Bununla əlaqədar olaraq şagird nailiyyətlərinin qiymətləndirilməsi prosesinə aid məsələlərindən ən başlıcasını onun şəxsi keyfiyyətlərinin diaqnostik yolları və metodlarının işlənib hazırlanması təşkil edir.

Ənənəvi təlimdə şagird nailiyyətlərinin qiymətləndirilməsi üçün istifadə olunan əsas formalar yoxlama yazı işləri (və ya testlər) və şifahi cavablardır. İki qiymət növü mövcuddur: cari və yekun qiymət. Cari qiymət ayrı-ayrı mövzu və bölmələrin şagird tərəfindən mənimsənilməsini yoxlayır, yekun qiymət isə tədrisin nəticələrini ümumiləşdirir.

Nəticəyönümlü təlimdə isə vəziyyət başqa cürdür. Belə ki, burada şagird nailiyyətlərinin qiymətləndirilməsi şagirdlərin biliklərə yiyələnmək, onlardan istifadə etmək, nəticə çıxarmaq bacarıqları haqqında məlumatların toplanması prosesi kimi qəbul edilir və aşağıdakı məqsədlərə xidmət edir:

Ümumiyyətlə, istənilən səviyyədə sinif və auditoriyada fərqli metodika ilə öyrəninlərin marağını tədris prosesinə cəlb etmək müəllimin pedaqoji səriştəsindən asılıdır. Bu o deməkdir ki, hər bir müəllim elə bu - yenidir bunu tədbiüq edim deyə dərsi maraqlı edə bilməz. O özü calışıb elə özüdə öz dərsi üçün yenilik yarada bilər.

## Ədəbiyyat

1. Babayeva Z.Y. At secondary schools the use of ICT at biology lessons. International Journal of Multidisciplinary Research and Development, India, 2015, Volume 2, Issue 11, Part B, p: 54-57
2. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 2009.
3. Əliyev A. Yeni (müasir) pedaqoji texnologiyalar və onlardan təlim praktikasında sistemli istifadənin əhəmiyyəti. “Təhsil problemləri” qəzeti, 21-30 iyun, 2007.
4. Həsənov A., Ağayev Ə. Pedaqogika. Bakı, 2007.
5. Qasımova L., Mahmudova R. Pedaqogika. Bakı, 2003.
6. Mehrabov A. Azərbaycan təhsilinin müasir problemləri. Bakı, 2007.
7. Mərdanov M. Azərbaycan təhsili yeni inkişaf mərhələsində. Bakı, 2009.
8. Nəzərov A., Mollayeva E. Müasir dövrün təhsil problemləri. (Mühazirə xülasələri) Dərs vəsaiti. Bakı, 2011.

**Rəyçi: dos. İ.Alverdiyev**

Göndərilib: 23.08.2020 Qəbul edilib: 25.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/79-81

**Ruhsara Seyfulliyevna Tulabayeva**
Ali Şir Nevaî Taşkent Devlet
Özbek Dili ve Edebiyatı Üniversitesi

# TAHİR MELİK'İN "*ELVEDA" ÇOCUKLUK* ROMANINDA ZAMAN VA ÇOCUK KARAKTERİNİN YORUMU

**Öz**

Makalede, yazar Tahir Melik'in *Elveda Çocukluk* adlı eseri analize çekilir. Çocuk karakterine ait ruhsal değişimler zaman etkeni çerçevesinde incelenir. Çocuğun ruh halindeki değişimler, zamanın eser olayları ile uygun halde ilerlemesi gibi hususlara değinilir.

***Anahtar kelimeler:*** *Zaman, mekan, çocuk karakteri, karakter, olay örgüsü, süje çizgisi, ruhsal değişim, ruh hali, facia, eğitim*

## Mental changes in child's character from the point of view of time in Takhir Malik's novel "Forgive childhood"

**Annotation**

The article analyzes the work of writer Tahir Malik "Goodbye Childhood". In it, mental changes in the character of the child are viewed and studied from the point of view of time. The article is based on the fact that the spirit of the child changes with the passage of time, the expression of the times of the present time.

***Key words:*** *Time, place, child image, character, plot, plot line, expression, mental state, mental image, hero, tragedy, upbringing*

İlk meydana geldiği günden beri edebiyatın en önemli unsurlarından biri edebî karakterdir. Karakterler yazarın bakış açısına, zaman ve mekana bağlı halde farklı şekil ve anlamda ortaya çıkar. Zaman ve mekan meselesi edebiyat biliminde araştırılmış ise de bu konuda araştırılması gereken hususlar hâlâ çoktur. Zaman ve mekan meselesi Rus edebiyatında Bahtin tarafından araştırılmış ise, Özbek edebiyatında bu konuyu Uzak Corakulov işlemiştir.

"Edebiyatta meydana gelen gerçek tarihî zaman, mekan ve insanı idrak etme süreci yavaş ve ağır ilerlemektedir. Mekan ve zamanın farklı özellikleri, bununla ilgili olarak, türler ve sanatsal betimlemenin gerçek yönleri insanoğlunun katettiği gelişme aşamaları ile bağlı halde araştırılmaktadır."[27]

"Macera romanın dünyası macera zaman ile yönetilir. Bu zaman; yıl, ay, saat, dakikalar ile değil "bir gün", "o gün", "aniden", "derken" gibi macera zaman birimleri ile ölçülür."[28]

Saygıdeğer hocalarımız tarafından ileri sürülen bu görüşler uzun yılların meyvesi olan eserleri, önemli romanları ve onların kronotop unsurlarını araştırmaya yönelik ise de güncel olmaları nedeniyle günümüz edebiyatı için de geçerlidir.

Çağdaş Özbek edebiyatında çocuk karakterinin kaleme alındığı eserler çoktur. Bu eserlerde çocuk karakteri farklı mekan, zaman ve koşullarda ele alınır. Görüldüğü gibi zaman, sosyal durum çocuk karakterini betimlerken en önemli etkenler olarak karşımıza çıkar.

*Elveda Çocukluk*, Tahir Melik'in önemli eserlerinden biridir. Eserde ele alınan esas konu kimsenin suçlu halde doğmadığı, çocuğu onun çevresi, toplumdaki türlü illetlerin suçluya dönüştürdüğü meselesidir. Konuyla ilgili olarak yazarın kendisi şöyle yazar: "Ben; ergenler ve gençlerin suç bataklığına batmalarına seyirci kalamam. Çocuk hapishanelerine her gidişimde yüreğim sızlar. Hür bir hayat süren, eğitim gören, meslek öğrenen bu gençler buralara nasıl düştüler?! Suç dünyası onlara bu kadar mı çekici geldi? Ben suç dünyasına *Şeytanat*, yani şeytanların idare ettiği zulüm ülkesi adını vererek "Dikkatli olun kardeşlerim, sakın bu dünyaya düşmeyin, sokakları çıkmaz olan bu dünyanın sonunda sadece acılı bir ölüm vardır." demek için yazdım. Yazdıklarımı uyarı olarak kabul etmenizi temenni ederim."

Nitekim, *Elveda Çocukluk*'un karakterlerinden biri olan 14-15 yaşlarındaki Kamariddin hayatın acımasız darbelerine çok erken maruz kalır. Ne acılıdır ki, onu böyle bir kısmete mahkûm edenler öz babası, vefasız ve hafifmeşrep annesidir. Çocuğun kalbindeki ilk isyan yetiştirme yurdundaki hakaret ve aşağılamalara karşı uyanır. İsyan yavaş yavaş öfkeye, öfke de gittikçe nefrete dönüşür. Sokakta insanlar yetiştirme yurdunun çocuklarını kovduklarında, anne babası olan çocuklar onlardan iğrenerek uzak durmaya çalıştıklarında

[27] Mihail Bahtin, Voprosı literaturı i estetiki, Hudojesvennaya Literatura, Moskova, 1975, s.234-235.
[28] Uzak Corakulov, Nazari Poetik Meseleleri, Gafur Gulam NMIU Yay., Taşkent, 2015, s.92.

çocuğun nefreti daha da büyümeye devam eder. Nihayet, annesinin müdavimlerinden olan bir “amca”nın hayatına son vermesiyle sonuçlanır.

İyi bir mühendis, başarılı bir doktor veya öğretmen olacak bir çocuk başkalarının, daha doğrusu, büyüklerin yüzünden hapis hayatına mahkûm olur. Çocuk, fidana benzetilir. Fidanın zamanında bakımının yapılıp sulanması gerektiği gibi çocuğa da şefkat gösterilmesi, eğitilmesi gerekir. Özellikle ergenin dünyası devamlı ilgi ister. O, doğadaki, toplumdaki her hadiseden kendi halince sonuçlar çıkarır. Eğer sonuç yanlışsa bu yanlış büyükler tarafından çocuğa bildirilir ve düzeltilir. Ergen, yakın dosta, tatlı söze, sıcak sevgiye ihtiyaç duyar. Eğer istediğini yakınlarından bulamazsa onu dışarıdan, yabancılardan bulmaya çalışır.

Çocukta ortaya çıkan isyan zaman ilerledikçe büyür, gelişir. Yazar, işte bu doğrultuda zamanın çocuğun karakterine, bakış açısına etkisini göstermeye çalışır. Yani çocuğun isyanı henüz nefrete dönüşmemişken onun ruhunda geri dönüş yolu vardır. Yalnız, onun ruhunu tedavi eden, ona doğru yolu gösteren biri olmaz. Onu eğitmesi gereken kişiler (babası, annesi, yetiştirme yurdu çalışanları, komşular) ya kendileri eğitime muhtaçtır ya da tamamen ilgisiz ve düşüncesizdir. Bu arada zaman geçer. Yazar zamanın geçtiğini rakamlarla ifade etmez. Çocuk büyüyerek yetiştirme yurdundan ayrılır ve annesinin yaşadığı eve gelir. Bu olay örgüsü ile yazar zamanın fonunu çizer. Okuyucu da zamanın geçtiğini olayların gelişmesi ile, çocuğun bakış açısındaki değişimler ile idrak eder. Çocuk, ilk önce annesine, insanlara karşı sevgisiz değildir. Büyüdükçe insanların ona davranışlarından etkilenerek içinde itiraz, isyan ve nefret duyguları gelişir. Buradan anlaşılmaktadır ki zaman şekli çocuk karakterindeki değişimleri meydana getirir.

*Elveda Çocukluk*’un ana karakteri Kamariddin ümitsizlik ruhunun etkisiyle öfkesine yenik düşer. Hiçbir zaman görmediği babası ve ilgisiz, vefasız annesinden sevgi ve şefkat bulamayınca sokaktaki kimsesiz ve yankesici çocuklara katılır. Kamariddin sadece yankesicilikle yetinmez. İçindeki kızgınlık ve nefret onu intikama sürükler. Neticede cinayet işleyerek hayatının geri kalan kısmını da berbat eder.

Kamariddin özel hapis okulunda okurken okulun onlar için asla açılmayacak büyük, ağır ve kahverengi kapısı karşısındaki kanepeye oturarak düşündüklerini hatırlayalım: “Elime tüfek verseler ve kapıdan anne babam içeri girse hiç tereddüt etmeden onları vururum. Sonra beni de vursunlar razıyım. Hayır, önce yargılanacağım. Mahkemede konuşacağım. Çocuğundan vazgeçen anne babanın cezası budur, diyeceğim. Anne babaları hayatta olup vazgeçilenler hepiniz aşağılık anne babalarınızı vurun. Birbirinize yalan yanlış sözlerle överek onları iyi insanlar olarak tanıtmayın. Acımayın, vurun onları, diyeceğim. Terk edilen çocuklara tüfek veriniz, diyeceğim! İşte ondan sonra beni vursunlar razıyım.”[29] Kamariddin böyle duygular içinde olmasına rağmen annesini öldürmez. Anlayamadığı belirsiz bir güç onu anneye el kaldırmaktan alıkoyar. Ama günün birinde sarhoş olarak evine dönen çocuğun annesiyle birlikte oturan “babasının arkadaşı”nı öldürmesine kimse engel olamaz.

Hiçbir facia tesadüf değildir. Tesadüf gibi görünen facia, hazır bir tasvirdir. Bu tasvirin ifadesi (ortaya çıkması) için uzun bir hazırlık süreci yaşanır. Felsefenin sebep sonuç ilişkisi gibi edebî eserde de bu hadisenin sanatsal gerçek olarak kabul edilmesi gerekir. Yazar, faciaya (sonuca) götüren durumu (sebebi) aşama aşama keleme alır. Burada zaman fonu net olarak gözlemlenir. Demek ki zaman artık olaylarla birlikte ilerler. Süje çizgisinden kahramanın büyüdüğünü, bakış açısının değiştiğini, artık eskisi gibi yalnız olmadığını, çevresinde kendine benzer serserilerin bulunduğunu öğreniriz. Kamariddin hafifmeşrep annenin yanında, onu devamlı olarak aşağılayan ortamda bağrı yanık ve yalnızdı. Onu dinleyen ve anlayan kişi olmadığı için hırsız yankesicilerle kolayca kaynaşır. Artık kendini yalnız hissetmez, kendisi gibi yalnızlar dünyası ona merhem olur. Daha sonraki olaylar suç dünyasındaki çirkinlikleri ortaya koyarak gelişir. Çocuğun ruhundaki kriz zirve noktaya ulaşır. Artık onu eğitmek kolay olmayacaktır. Kalbinde insanlara karşı nefret hissi, hep birilerinden intikam alma hırsı çoktan onun benliğine dönüşmüştür. Nihayet, evine gelir ve annesiyle birlikte oturan “amca”yı öldürür. Dostoevskî, Raskolnikov’un cinayet işlemesi için onu uzun süre hazırlar. *Elveda Çocukluk*’ta ise kahraman kendi kendini hazırlar. Raskolnikov birçok kez tereddüde kapılır, suç işlemeye cesaret edemez. Kamariddin’in ise tereddüt etmesine, cesaret edememesine ihtiyaç yoktur. Çünkü toplum, çevredeki insanlar onu çoktan hazırlamıştır.

Kamariddin’in yukarıda aktarılan düşüncelerinden onun nasıl bir ruh hali içinde büyüdüğünü anlamak zor değildir. Yazar, söz konusu ağır ruh halini kaleme alırken onu ortaya çıkaran etkenlere değinir. Elveda Çocukluk’ta zaman şekli çocuk karakterini ortaya koyarken iki görevi üstlenmiştir: 1. Zaman, çocuk karakterini aydınlatmaya yaramıştır. Yani çocuğun ruhundaki değişimler zaman ve yılların geçmesiyle birlikte gelişir. 2. Zaman, eserin süje çizgisine uygun halde vuku bulur. Her iki durumda da zaman kavramı esas fon görevini yerine getirerek karakter ve olayların tasvirinde de zaman aynı etkinliğini korur. Okuyucu zamanın geçmekte olduğunu hisseder.

---

[29] Tahir Melik, Elveda Çocukluk, Taşkent, s.41.

Kamariddin, bazen şuurulu bazen de şuursuz halde etrafındaki kişilere özenerek yaşar. Başkaları ile ilişki kurarken kendini anlamaya başlar. Başkalarına lazım olup olmadığını bu ilişkiler yardımı ile öğrenir. Yazar, günümüz çocukları konusunda çok güncel meseleye değinerek çocuğun her an yaşayabileceği ruhsal krizden hepimizi uyarmaktadır. Günümüzde de toplumdan yalnızlaşarak sanal dünyadan dost arayan çocuklar insanoğlu için birer ikazdır.

Özetle, Tahir Melik'in *Elveda Çocukluk* adlı eseri ergen çocukların özgü özellikleri, onların tabiatına has ruh halleri etkili bir biçimde kaleme almış, karakter ve zaman hadiselerini uyum içinde ifade edebilmiş, toplumda gençlerin eğitiminin ne kadar önemli olduğunu ortaya koyabilmiştir.

**Kaynakça**

1. Tahir Melik, Elveda Çocukluk, Yangi Asr Avlodi Yay., Taşkent, 2019, s.41.
2. Mihail Bahtin, Voprosı literaturı i estetiki, Hudojesvennaya Literatura, Moskova, 1975, s.234-235.
3. Uzak Corakulov, Nazari Poetik Meseleleri, Gafur Gulam NMIU Yay., Taşkent, 2015, s.92.
4. Tahir Melik, Ümidimiz Yıldızlarına, Yangi Asr Avlodi Yay., Taşkent, 2017, s.780.
5. Tahir Melik, Güneşimiz Sönmesin, Yangi Asr Avlodi Yay., Taşkent, 2017, s.493.

Göndərilib: 29.08.2020 Qəbul edilib: 31.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/82-85

**İradə Cəfər qızı Bəylərova**
Azərbaycan Dillər Universiteti
bayirada@gmail.com
**Yaqut Mirbala qızı Əliyeva**
nicatworld@mail.ru

# ORTA MƏKTƏBDƏ XARİCİ DİLİN TƏDRİSİNDƏ DİNLƏMƏNİN ROLU

**Xülasə**

Məqalədə müəllif orta məktəblərdə xarici dilinin tədrisində dinləmənin rolundan bəhs etmişdir.

Məqalənin giriş hissəsində istənilən xarici dilin öyrədilməsində ünsiyyətin əhəmiyyətindən söz açılır. Müəllif, nitqin qarşılıqlı əlaqəsindən söz açaraq, göstərmişdir ki, hər hansı bir dil yalnız ünsiyyət zamanı formalaşır. Şagirdlər tənha deyil, bir-biri ilə qarşılıqlı əlaqədə olaraq diskussiyalar və söhbətlər zamanı dilə daha yaxşı yiyələnə bilərlər. Məhz bu prosesin uğurla həyata keçirilməsi üçün mövcud olan danışıq, yazı, oxu kimi dinləmənin də rolu böyükdür. Şagirdlərin eşitmədən danışması mümkün olmadığı üçün xarici dilin tədrisi zamanı müəllimin onların dinləmə qabiliyyətini inkişaf etdirmək üçün müxtəlif üsullardan istifadə etməsi məqsədəuyğundur.

Məqalədə, bu üsulların uğurlu alınmasi üçün bəzi faktorların, məsələn, şagirdin bilik və yaş səviyyəsi, dinləmə qabiliyyəti, psixoloji xarakteri nəzərə alınaraq müəllimin düzgün tapşırıq qurmasının böyük əhəmiyyətindən bəhs edilir. Həmçinin hər sinif üçün ayrıca audiomətnlərin seçiminin vacibliyi də qeyd edilir. Məqalədə, müəllif dinləyərək mətni anlamağa xidmət edən üsullardan bəhs edərkən ingilis dilində bəzi misallara müraciət etmişdir.

***Açar sözlər:*** *dinləmə, bacarıq, ünsiyyət, nitq, məhsuldar, anlaşıqlı, nail olmaq, uğurlu, diqqətli*

## The role of listening in teaching a foreign language at secondary school

**Summary**

In the article, the author tells about the role of listening in teaching a foreign language at secondary school. In the introduction part of the article it was mentioned about the importance of the development of speech activity in teaching any foreign language.

It is said that a language is formed during communication with one-another.

Pupils can master a language better not alone but through discussions and conversations. In successful realization of this process as speaking, writing and reading listening activity is of great importance too. As speaking without listening is impossible for pupils in teaching a foreign language, a teacher should develop their listening skills using different methods.

In the article, it is mentioned that, a teacher should choose the right exercises. Some factors as the psychological character, knowledge and age levels as well as listening ability of pupils should be taken into consideration by a teacher for a successful realization of these methods.

Besides, the choice of audio texts for each class should be individual. The author brought examples in English serving to understanding the speech through listening.

***Key words:*** *listening, skill, communication, speech, productive, comprehensive, achieve, successful, attentive*

Nitq fəaliyyəti mürəkkəb bir prosesdir. O, dil sisteminin anlayışı, nitq ünsiyyəti, dilin qarşılıqlı əlaqəsi və bütövlükdə insan fəaliyyəti ilə bağlıdır. Son zamanlar xarici dilin tədrisində dil sisteminə xüsusi diqqət verilir. Lakin bu nadir halda müsbət nəticələnir. Növbəti addım kommunikativ öyrətmə olmuşdur ki, bu da nəticədə əhəmiyyətli ideya və məlumatlarla fikir mübadiləsi aparmağa zəmin yaradır. Ünsiyyət yalnız məqsəd deyil, həm də öyrətmə üsuluna çevrilməlidir.

Son vaxtlar metodistlər, elmi nailiyyətlərdən istifadə edərək, ünsiyyətin təsir xarakterinə diqqət yetirərkən, öyrətmənin tərkib hissəsi kimi, nitqin əlaqəli təsiri fikrini irəli sürmüşlər. Nitqin qarşılıqlı təsiri dedikdə, nitq və ya qeyri nitq hərəkətlərinə cavaba hazır olmaq məqsədi ilə, insanların bir-biri ilə qarşılıqlı əlaqəsi nəzərdə tutulur. Qarşılıqlı təsir olmazsa, ünsiyyət də olmaz .

Şagirdlərin birlikdə sinifdə deyil, yanaşı oturaraq işləmələri müsbət sayılmır. Qarşılıqlı əlaqə ünsiyyət üçün stimul və motiv yaradır. Ünsiyyəti həyata keçirmək üçün qarşılıqlı əlaqə şəraitində, məlumatlar və şəxsi maraqların olması lazımdır.

Şifahi və yazılı nitqi tamamilə bir-birinə əks hesab etmək olmaz, çünki, müasir həyatda onlar arasındakı sərhəd yavaş-yavaş aradan qaldırılmaqdadır.

Həqiqətən də, görəsən konspekt üzrə çıxış edən televiziya aparıcısının və ya auditoriyada mühazirə oxuyan mühazirəçinin ntqini hansı növə aid etmək olar? Tamamilə aydındır ki, bu formalarda həm şifahi və həm də yazılı nitq üsullarından istifadə edilir.

Danışıq, dinləmə, yazı və oxunun sıx qarşılıqlı əlaqəsini qeyd edərkən, göstərilən nitq fəaliyyətlərinin hər birinin müxtəlif məhsuldarlığından da söz açmaq lazımdır. Oxu və yazı öz linqvistik quruluşuna görə fərqli ifadə olunur, dinləmə isə məlumatın anlanmasıdır. Tədris zamanı nitq fəaliyyətinin hər birinin xarakteri qarşılıqlı əlaqə və qarşılıqlı şərtilik əsasında nəzərə alınmalıdır.

Beləliklə metodikada 4 ünsiyyət bacarığı: oxu, danışıq, dinləmə və yazı fərqlənir və tədrisi həyatla əlaqələndirməyə imkan yaradır. Hər bir istənilən halda ünsiyyət dinləyərkən, danışarkən, yazarkən, ya da oxuyarkən baş verir. Buradan nitq fəaliyyətinin əsas növlərinin məhsuldarlığı belə müəyyən edilir: danışıq və yazı, məlumatın göndərilməsi ilə əlaqəlidirsə, dinləmə (reseptiv) və oxu onun qəbul edilməsidir. Qeyd etmək lazımdır ki, real ünsiyyətdə göstərilən nitq fəaliyyətinin növlərinin heç biri bir-birindən təcrid olunmuş halda mövcud deyil.

Real ünsiyyət tərəflərin bir-biri ilə qarşılıqlı əlaqəsi zamanı baş verir. Məsələn, danışan şəxsin niyyəti həmişə dinləyənə təsir göstərərkən ondan cavab reaksiyası gözləyir. Ünsiyyətə qoşulmaq üçün şagird həm məhsuldar (danışıq və yazı) həm də reseptiv (dinləmə və oxu) bacarıqlarına yiyələnməlidir.

Tədris zamanı nitq fəaliyyətinin növlərinin izolyasiyası onunla nəticələnə bilər ki, şagirdlər müəyyən bir mövzuya fikir bildirmək qabiliyyətinə sahib olurlar, ancaq nitqi dinləyərək qavramayacaq və beləliklə də ünsiyyətdə iştirak edə bilməyəcək, və yaxud əksinə, oxunan və dinlənən frazanın mənasını anlayacaq, ancaq öz fikrini formalaşdırmağı bacarmayacaq. Beləliklə, məhsuldar və reseptiv fəaliyyət növlərinin hər bir bacarıqlarının bir-birindən təcrid olunaraq öyrədilməsi fikri səhv olardı.

Real ünsiyyətdə nitq fəaliyyətinin 4 növünün bir-biri ilə əlaqəli olduğu kimi, tədris prosesində də onların istənilən növü inteqrativ olmalıdır. Bu o deməkdir ki, məsələn, oxu bacarığını öyrətməklə, eyni zamanda dinləmə, danışıq, yazının da öyrədilməsinə baza yaratmış oluruq.

Ünsiyyət insanlar arasında birgə fəaliyyət tələbatından doğur. İnsanlar bir-biri ilə ünsiyyət qurmağa həmişə ehtiyac duymuşlar. Son dövrlər virtual ünsiyyətə daha çox üstünlük verilir. Lakin buna baxmayaraq ünsiyyət yenə də insan həyatının əsas tərkib hissəsidir. Ünsiyyət zamanı təsirli danışmaq da, dinləmək də mühüm əhəmiyyət kəsb edir. Ünsiyyətin effektivliyi dinləyicinin aktiv olmasından asılıdır. Müəllim dərs zamanı şagirdin danışığa diqqətlə qulaq asmağını təmin edərsə, o zaman müsbət nəticədən və maraqlı ünsiyyətdən söz açıla bilər.

## Dinləmənin tədrisi

Son zamanlar "dinləmə" terminindən metodik ədəbiyyatda müqayisəli olaraq istifadə olunur. Əğər dinləmə səslərin akustik qəbulu kimi anlaşılırsa, o zaman dinləməyə, səslənən nitqin qəbulu və anlaşması prosesi də daxildir.

Dinləmə danışıqla yanaşı xarici dildə ünsiyyətə imkan yaradır. Nitq prosesi iki tərəfli proses olduğuna görə, dinləmənin lazımınca qiymətləndirilməməsi, yəni, şagird nitqi dinləyərək anlamasa, bu onun dil hazırlığına həddən artıq mənfi təsir göstərər. Müxtəlif ölkələrin şagirdlərinin təcrübəsinin araşdırılması göstərir ki, məhz dinləmə bacarığının düzgün formalaşdırılmaması, çox vaxt ünsiyyətin pozulmasına səbəb olur.

Şagirdlərin dediklərinə görə bəzən onlar verilən sualları başa düşmürlər və fakt olaraq təsdiqləyirlər ki, xarici dildə ünsiyyət üçün dinləmənin tədrisi vacibdir. Dinləmə bacarığı yalnız nitqin dinləyərək başa düşülməsi prosesində formalaşır. O zaman müxtəlif templi, müxtəlif intonasiya quruluşlu, düzgün qaydalara uyğun səviyyəli nitqin anlanılması bacarığına tələbat var. Dinləmənin hər hansı bir xarici dildə hətta ən minimal səviyyədə mənimsənilməsi, adı çəkilən nitq fəaliyyətini əsaslandıran bir sıra əməliyyatların formalaşmasını həyata keçirir ki, bunlardan səs axınının tanınması, dinləmə vahidinin dərk edilməsi, dinlənilən mətndəki məlumatın mənasının aydınlaşdırılmasını göstərmək olar.

Baxmayaraq ki, dinləmə prosesi özünü biruzə vermədən baş verə bilər, ancaq bu yüksək intellektual səy tələb edən bir prosesdir.

Ünsiyyət prosesində müəyyən çətinliklər müşahidə olunur. Bu psixoloji xarakter daşıyır. Dinləmənin tədrisində şagirdin psixoloji xüsusiyyəti, durumu onun fəal dinləmə qabiliyyətinə öz mənfi təsirini göstərir. Belə ki, əgər şagird, özünə əmin deyilsə, onun öz dinləmə bacarığı səviyyəsinin kifayət qədər olduğuna şübhəsi varsa, o zaman müəllimin, maraqlı diskussiya xarakterli qrup və cütlük işlərindən, oyunlardan istifadə etməsi daha effelktiv olur. Belə ki, kiçik qruplarda və ya cütlük işi zamanı onların utancaqlığı aradan qalxır, anlamadıqlarını təkrar dinləmək üçün müraciət etmək onlar üçün daha asan olur. Bu vərdiş halına keçərək gələcəkdə dinləməyə marağı artırır və onların daha aktiv dinləməsinə müsbət təsir göstərir.

Dinləmə zamanı dinləyicilər, mürəkkəb perseptiv – mnemonik fəaliyyət, analiz, sintez, deduksiya, induksiya, müqayisə, əksləşdirmə, abstraktlaşdırma, konspektləşdirmə və sairə kimi düşündürücü əməliyyatları həyata keçirirlər. Dinləmənin uğurlu olması obyektiv, həm də subyektiv faktorlarla müəyyən olunur. Obyektiv faktorlara, təqdim olunan mətnin xüsusiyyətləri və dərketmənin baş verdiyi şərait daxildir. Subyektiv faktorlar isə dinləyənin psixi xüsusiyyətləri və onun hazırlıq səviyyəsi ilə müəyyən olunur. Dinləmə üçün mətn seçilərkən, onun dil xüsusiyyətləri, tərkib xarakteri və kompozisiya xüsusiyyətləri nəzərə alınır.

Tədris prosesində şagirdin psixi xüsusiyyətlərinin qiymətləndirilməsi zamanı, hər şeydən əvvəl onun nitq dinləmə bacarığı, diqqət və yaddaşı, dil təhmini xüsusiyyətləri, düzgün proqnozlaşdırma qabiliyyəti və daxili nitqin inkişafı səviyyəsi nəzərə alınır.

Motivasiya dinləmənin formalaşdırılmasında əsas şərtdir. Əgər dinləyən qulaq asmağa tələbat duyarsa, bu onun psixi potensialının maksimum səfərbərliyinə səbəb olur. Məsələn, müəllim prizlər təyin edərək şagirdə belə bir tapşırıq verir: “mətni dinləyin və onu, maksimum tərkibindəki sözlərlə nəql etməyə çalışın.” Bu cür yarış tipli dinləmə öyrətmə metodu şagirdləri birincilik qabiliyyəti uğrunda yarışmağa sövq edir ki, bu da onlarda diqqətlə dinləmə bacarığı yaradır. Nəticədə hissiyat üzvlərinin həssaslığını artırır, diqqəti daha məqsədyönlü edir, düşünmə prosesinin intensivliyi artır.

Xarici dilin öyrənilməsində motivasiyanın yaradılması və ümumiyyətlə dil və dünya haqqında yeni dərketmə bilgiləri əldə etmək, ünsiyyətdə aktiv iştirak etmə kimi dinləmə tələbatının yaradılması üçün audiomətnlərin seçimi vacib əhəmiyyət kəsb edir. Həddən artıq çətin mətnlər şagirdlərin məyusluğuna və uğura inamsızlığına səbəb ola bilər. Həddən artıq asan audiomətnlər isə həmçinin arzuolunmazdır, çünki çətinliyə üstün gəlməyin boşluğu, işi maraqsız edir və həm də bu xarici dilin öyrədilməsi prosesinin inkişaf etdirici faktoru ola bilmir.

Sözsüz ki, bu və ya digər yaş qruplarından olan şagirdlərin maraqları nöqteyi nəzərindən audiomətnlərin mövzularının seçimi vacib şərtdir. Aşağı siniflərin şagirdləri üçün heyvanların həyatı ilə bağlı nağıl tipli sujetlər əsasında olan mətnlər daha maraqlı və məqsədə uyğundur. Eston metodistlərinin araşdırmalarına görə, yuxarı sinif şagirdlərini siyasət, texnika ilə bağlı mətnlər və detektivlər maraqlandırır. Onlar sevgi, dostluq, başqa ölkələrin xalqlarının həyatı və təbiət haqqındakı audiomətnləri daha böyük məmnuniyyətlə dinləyirlər. Buraxılış siniflərinin şagirdləri peşə seçimi haqqda mətnlərə maraq göstərirlər.

Uğurlu dinləmənin obyektiv stimulu, audiomətnlərin tərkibinə yumor elementlərinin daxil edilməsidir. Məsələn, aşağıda verilmiş məzəli mətnə qulaq asarkən şagird tam sərbəst, əylənmək məqsədi ilə onu dinləyir.

“One day a small boy comes to school. The teacher asks him: “How many ribs does a person have?” The boy answers: “I don’t know” The teacher asks: “Why?” The boy says: “Because I’m ticklish”.

Şagirdin işlətdiyi ifadə “I’m ticklish” “Qıdığım gəlir” onun yaddaşında daha yaxşı qalır, çünki bu yumorla bağlıdır və bir ifadə ilə mətnin məzmununu açır və oğlanın, dərsə hazır olmasa da hazırcavablığını göstərir. Bu o deməkdir ki, mətnlər nə qədər maraqlı olarsa, dinləməyə maraq artar və xarici dildə söz öyrənmək bacarığı da inkişaf edər. Həmçinin, yumoristik üsulların sayəsində şagirdin psixoloji gərginliyi müəyyən dərəcədə neytrallaşır. Bu cür dinləmə fəaliyyətinin həyata keçirilməsi uğurlu dinləmənin həlledici şərtidir. Şagirdlərdə dinləməyə maraq və tələbatın yaranması o zaman uğurlu olur ki, o nə üçün dinlədiyini, anladığını, necə təsvir etdiyini, əldə etdiyi məlumatdan necə istifadə edəcəyini dərk edir.

Konkret dərs tapşırıqları, dinlənilən məlumatın və onun tam qavranması göstəricisindən asılı olaraq iki müxtəlif dinləmə növü mövcuddur: tam anlayaraq dinləmə və mətnin əsas məzmununun tam anlanması ilə dinləmə. Tam anlayaraq dinləmə üçün olan mətnlərdə anlamaya mane olan heç bir ifadə və söz olmur. Əgər mətndə ayrı-ayrı yeni sözlərə rast gəlinərsə bu şagirdlər tərəfindən asanlıqla başa düşülür. Bunlara beynəlmiləl elementlərdən ibarət sözlər və ya mənası məzmundan anlaşılan sözlər aiddir.

Mətnin əsas məzmununu anlayaraq dinləmə zamanı, şagirdlər hətta həmin mətnin tərkibində müəyyən faiz yeni söz və ya ifadələr olsa belə mətni tam olaraq dərk edə bilirlər. Bu, məlumatı anlamaq üçün dinləyicinin detallara varması və açar sözlərin olması sayəsində baş verir. Bundan əlavə, şagirdlər məlumatı daha dəqiq başa düşmək üçün bəzi aydınlaşmaya xidmət edən suallar verməyi bacarmalıdırlar. Məsələn: “Please, repeat the word or the expression in the 3rd sentence once more,” “Sorry for my interrupting you, will you repeat again?”

Uzun illər boyu dinləmənin öyrədilməsi zamanı, müəllim tərəfindən şagirdlərin fəaliyyətlərinin obyektiv qiymətləndirilməsi, dərsin keyfiyyətinə öz müsbət təsirini göstərir. Bununla yanaşı bəzi çətinliklərlə üzləşmə də mümkündür. Məsələn, materialın həcminin böyüklüyünə görə və onun tam dərk edilməsinə ayrılan vaxtın kifayət qədər olmaması əsas səbəb kimi göstərilir.

Bir çox müəllimlərin bu işi ətraflı araşdırması göstərir ki, bəzi uğursuzluqların səbəbi əsas metodik tövsiyyələrə formal yanaşma, onlara lazımınca əməl etməmək halları ilə bağlidir. Bunlara dil mühitinin olmaması, təklik, vaxt darlığı, dinləmə qavrayışına müraciət etməmək, müəllimin hədsiz müdaxiləsi, dəstək elementlərinin (sxem, qrafik, kart, şəkil, açar sözlər) olmaması şagirdlərin psixoloji xüsusiyyətlərinin nəzərə alınmaması, onların diqqət və yaddaşlarının lazımi dərəcədə olmaması aiddir.

Nitqin dinləyərək qavranmasının əsas maneələrindən biri də dil mühitinin olmamasıdır. Bunun nəticəsində şagird müəyyən bir mətn dinləyərkən, orada səslənən sözlərin mənasını bilsə də dinləyərkən onları tanımaya bilər. Şagirdlər əsasən məlumatı göz yaddaşı kanalı ilə qavramağa alışırlar. Müəllimin onlara mətni dinləyərkən onu izləməyə icazə verməsi dinləyərək dərketmənin inkişafına mane olur. Şagirdlərin dinləməklə anlaması üçün mümkün qədər faydalı üsullardan istifadə etmək daha məqsədə uyğundur.

Beləliklə, şagirdlərə ilk dinləmə zamanı ümumi məzmunun başa düşülməsi üzrə, ikinci dinləmə zamanı isə məlumatın ideyaları və detallarının anlanılmasına aid tapşırıqlar təklif etmək olar.

Bəzən müəllim öz nitqinin doğma dilə tərcüməsi yolu ilə anlamaya" kömək" edir ki, bu da qarşıya qoyulmuş məqsədə gətirib çıxarmır. Bu şagirdləri demobilizasiya edir, onlar xarici nitqə qulaq asmırlar, onun ana dili variantını gözləyirlər. Bundan əlavə, yaxşı olardı ki, şagird mətni doğma dil daşıyıcısını dinləyərək başa düşsün. Bunun üçün "conversation class" ünsiyyət üçün ayrıca klubların təşkili və şagirdlərin orada aktiv iştirakı da onların marağına səbəb olaraq dinləmə qabiliyyətinin inkişafına müsbət təsir edər.

Beləliklə, xarici dilin tədrisinə xidmət edən dinləmə qabiliyyətinin inkişafına yuxarıda qeyd olunan üsul və tövsiyyələrin nəzərə alınması dilin tam anlaşılması və mənimsənilməsi üçün böyük əhəımiyyət kəsb edir.

## Ədəbiyyat

1. Рогова Г.Б., Рабинович Ф.М., Сахарова Т.Е. «Методика обучения иностранным языкам в средней школе». М., Просвещение, 1991: 287с.
2. Geoffrey Broughton, Christopher Brumfit, Roger Flavell, Peter Hill and Anitas Pincas, Second Edition London and New York, 1980
3. Internet: https:// kayren.az
4. Internet: hz.az.com

**Rəyçi: dos. L.Məcidova**

Göndərilib: 27.08.2020 Qəbul edilib: 29.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/86-90

**Xəyalə Şahverdi qızı Əliyeva**
Azərbaycan Dillər Universiteti
xxayala@mail.ru

# BƏDİİ MƏTNLƏRDƏ LEKSİK-ÜSLUBİ VASİTƏLƏRİN ROLU

**Xülasə**

Məqalədə Azərbaycan və ingilis ədəbiyyatından götürülmüş bədii mətn nümunələri əsasında leksik-üslubi vasitələrin rolundan bəhs edilərək, bu sahədə araşdirma aparan mütəxəssislərin fikirlərinə istinadlar edilmişdir. Beləki, mətnin formalaşmasına üslubi vasitələr güclü təsir edir. Üslubi vasitələr dil səviyyələrinə görə qruplaşdırılır və fikri aid olduğu səviyyəyə uyğun olaraq ifadə edir. Aparılan tədqiqat əsasında məlum oldu ki, mətnləri üslubi vasitələrsiz təsəvvür etmək mümkün deyil. İstənilən mətn də üslubi vasitələrdən ibarətdir. Onlardan nə dərəcədə çox istifadə isə mətnin yazıldığı üslubdan asılıdır. Üslubi vasitələrin istifadəsi isə fikrin ifadəsini daha emosional, daha qüvvətli edir. Dilin obraz yaradan vasitələri arasında leksik-üslubi vasitələrin də öz yeri vardır. Leksik səviyyədə üslubi vasitələr mətndə mənanın sabitləşməsini təmin edir. Bu vasitələr də fikrin daha dərin çalarda ifadəsinə dəlalət edir.

***Açar sözlər:*** *bədii mətn, üslubi vasitə, ekspressivlik, kontekst, leksik məna*

## The role of lexical stylistic devices in lierary texts

**Summary**

The article deals with the lexical stylistic devices based on literary text samples taken from Azerbaijani and English literature.References are made to this views of scholars conducting research in this area. Thus, stylistic means have a strong influence on the formation of the text.Stylistic devices are grouped according to language levels and express ideas according to the level to which they belong. The research revealed that it is impossible to imagine texts without stylistic devices. The extent to which they are used depends on the style in which the text is written. The use of stylistic devices makes the expression of thought more emotional and powerful. Lexical-stylistic means have a special place among the means of language creation. At the lexical level, stylistic devices ensure the stabilization of meaning in the text and more comprehensive expression of idea.

***Key words:*** *literary text, stylistic device, expressiveness, context, lexical meaning*

## Giriş

Bədii ədəbiyyat aləmi elə “yenidən yaradılmış” dünyadır ki, o gerçəkliyin təsvirini müəllifin yaradıcılıq dərəcəsinə uyğun olaraq ifadə edir. Bədii mətnlərdə biz təkcə yazıçının dünyasını deyil, eyni zamanda yazıçının, onun üstünlüyünü, qınaq obyektini, qürurunu, qəbul etmədiyi situasiyaları və s. bu dünyada görürük. Yazıçı kontinuumundan istifadə edir və bununla da mətndə üslubi incəliyi artırır.

Hər bir bədii mətnin yaranmasına səviyyələr üzrə üslubi vasitələr öz çalarlarını əlavə edirlər. Müxtəlif səviyyələr üzrə üslubi vasitələr bədii mətni fərqli aspektdən emosional edir.

Fonetik səviyyədə üslubi vasitələr daha çox səslənmədə üslubi çalar yaradırsa, leksik səviyyədə üslubi fiqurlar daha çox mənada emosional gücü artırırlar.

Leksik səviyyədə üslubi vasitələr mətndə mənanın sabitləşməsini təmin edir. Sözərin mənasından istifadə edərək yazıçı epitet, metafor, metonimiya, cinas, zevqma kimi bir sıra üslubi vasitələr yaradır. Bu vasitələr fikrin daha dərin çalarda ifadəsinə dəlalət edir və mətndə koherensiya ilə koheziya tamamlanır. Mətndə koherensiya və koheziya mövcud olmasa o, anlaşıqlı ola bilməz. Üslubi vasitələr də koheziya və koherensiyanın vəhdətini təmin edir.

Üslubi vasitələr mətnin üslubi analizi üçün əsas rol oynayır və onlar bir-biri ilə əlaqəlidir. A.Məmmədov koherensiya haqqında belə qeyd edir: “Koherensiya dildə deyil, cəmiyyətdə mövcuddur”(2).

Koherensiya yazıdakı ideyalar, cümlələr, abzaslar, hisslər arasında yaradılmış semantik birliyə istinad edir və oxucunun mətni qavramasına imkan verir (2, s. 56).

Bədii ədəbiyyatın dili bəzən səhvən ədəbi dil adlandırılır. Bəzi alimlər onu ədəbi dilin funnksional üslublarından biri hesab edir. Əslində bədii nitq üçün xarakterik cəhət odur ki, burada yalnız ədəbi dilin müxtəlif funksional vahidlərinin deyil, həmçinin xalq dili, sosial və professional jarqonlar, dialektlər kimi bütün dil vasitələrindən istifadə etmək mümkündür. Bu vasitələrin seçimi və istifadəsini yazıçı estetik əsərini yaratmağa nail olmaq üçün yönəltdiyi niyyətinə uyğun olaraq işlədir.

Dil vahidlərinin üslubi keyfiyyətləri müxtəlifdir. Bu keyfiyyətlər dilin fonetikası, leksikası və qrammatikasının imkanları sayəsində yaranır, nitqə üslubi çalarlıq gətirir, onu səlis, çevik, mənalı və kəsərli edir, estetik təsir gücünü artırır. Dil vahidlərinin üslubi imkanlarından danışarkən prof. Ə.Dəmirçizadə yazır: "Üslub dedikdə biz sözlərin, ifadələrin, qrammatik vasitələrin və fonetik imkanların məqsədəuyğunluq əsasında seçilmiş vahidlər sistemini başa düşürük". Fonetik, leksik, morfoloji, sintaktik normalar ədəbi dilin strukturu ilə bağlı olub nitqin düzgünlüyünü təmin edirsə, üslub normaları leksik-qrammatik normaların bir növ törəməsi olub nitqin gözəlliyini, ifadəliliyini, dəqiqliyini artırmaqla ünsiyyəti asanlaşdırır, onun təsirli, cəlbedici olmasını, danışan, dinləyən və oxuyanın ən incə məqamları, mətləbləri ifadə və dərk edə bilməsini təmin edir (3, s. 70-78).

V.V.Vinoqradov qeyd edir: "Bədii ədəbiyyatın dilində istifadə olunan üslub anlayışı işgüzar, məişət, hətta publisistik və elmi üslublarla nisbətdə fərqli məzmundadır. Bədii ədəbiyyatın dili digər üslublarla tamamilə əlaqəli deyil, o, onlardan istifadə edir və onları özünəməxsus kombinasiyalarda və dəyişdirilmiş formada özünə bağlayır (9, s. 113).

Dilimizin zənginliyini, dolğunluğunu, poetikliyini özündə əks etdirən Dədə Qorqud dastanından aşağıdakı kimi misal göstərək. Məsələn, mətndə "Dəli Dondar" adı varsa, alliterasiya "d" səsi üzərində, "Qazan" varsa "q" səsi üzərində qurulur. *Dəmir Qapı Dərbənddəki dəmir* qapıyı təpib alan... Dəli Dondar çapar yetdi, Qaracuğun qaplanı, qonur atın əyası, qalmış yigit arxası Salur Qazan və s. Digər nağıl və dastanlarımızda, yazılı ədəbiyyatımızda antroponimlərdə alliterasiyanın zəngin formalarından istifadə olunmuşdur. Alliterasiya ifadəni, cümləni təşkil edən sözlərin əvvəlində və ya ortasında eyni, yaxud yaxın samitlərin işlənməsidir. Bu cür səs düzümünün yaratdığı musiqi, ahəng söz birləşmələri, atalar sözləri, frazeoloji vahidlərin deyilişində özünü daha çox göstərir. Məsələn, "Qalan işə qar yağar" (6).

Danışıq zamanı üslubi effekt və səlislik yaratmaq, lüzumsuz təkrarlara yol verməmək, fikrin daha təsirli, ifadəli və dəqiq ifadə edilməsi məqsədilə rəngarəng sinonimlərdən istifadə olunur ki, onlar nitqin təsir gücünü artırır, emosionallıq və ekspressivlik yaradır ki, onlar incə məqamları ifadə etmək üçün geniş və rəngarəng üslubi imkanlara malikdir. Danışan fikir və hisslərini daha dəqiq ifadə etmək üçün sinonim cərgəyə məxsus lazımi sözü yerli-yerində elə işlədir ki, bu nitqdə dəqiqliyi yaradır, eyni zamanda, ahəngdarlıq təmin edir.

Leksik vasitələrdən, o cümlədən sinonimlərdən istifadə şifahi nitqə bir növ yaradıcı xarakter verir. Bədii təsvir vasitəsi kimi antonimlər nitqdə lakoniklik, konkretlik, obrazlılıq yaradır. Antonimlərdən dilin bütün üslublarında istifadə olunsa da, onlar üslubi vasitə kimi bədii ədəbiyyatda, poeziyada daha geniş şəkildə işlədilir.

Nitqin emosionallığını artıran, ona üslubi çalarlıq verən vasitələrdən biri də xitablardır. Xitablar dinləyicinin diqqətini söylənilən məsələyə cəlb etmək məqsədi ilə işlənir. Bir sıra hallarda danışan cansız qüvvələrə müraciət edir ki, belə xitablar üslubi məqsəd daşıyır. Sırf ekspressiv səciyyə kəsb edən bu xitablar bədii ədəbiyyat üçün səciyyəvidir.

İşləndiyi sahələrlə bağlı olaraq, Azərbaycan ədəbi dili beş əsas üslubu özündə birləşdirir: işgüzar, mətbuat, bədii, elmi və məişət üslubları. Azərbaycan ədəbi dilinin müasir mərhələsində bu üslubların hamısı yüksək dərəcədə inkişaf etmişdir.

Üslubi vasitələrin bədii üslubda çox istifadəsi bu üslubun emosionallığı, metaforikliyi ilə əlaqədardır. Bədii üslubda subyekt, yəni yazıçı oxucuda təsiri qüvvətləndirmək üçün mətni yazarkən müxtəlif üslubi fiqurlardan istifadə edir. Bu zaman yazıçı linqvistik vasitələrdən istifadə edərək onları müxtəlif formada birləşdirir və ya ayırır, nəticədə daha təsirli və obrazlı vasitələr, yəni, üslubi fiqurlar əldə edirlər.

Üslubi vasitələr bədii mətnlərdə təsviri alətlər kimi qəbul edilir. Onlar sözlərin adi istifadəsindən də üstün tərəflərini ifadə edir. Bəzən yazıçı fikrini dolayı izah etmək istəyir. Bunun üçün o, ədəbi mənalarından daha dərin mənaları olan üslubi fiqurlardan istifadə edir. Üslubi vasitələr mətni daha canlı, daha maraqlı edir və mənanı öz üzərində saxlamağa imkan verir.

Üslub bir məfhum kimi qədim Yunanıstanda meydana gəlmiş, sonralar dünya dilçiliyində müxtəlif səviyyələrdə tədqiq olunmuşsa da, Azərbaycan dilçiliyində XX əsrin əvvəlində tədqiqat meydanına çıxmışdır. İlk əvvəllər "dilin gözəlliyi", "yazıçının fərdi üslubu", "ünsiyyət manerası", "gözəl nitq", "axıcılıq, dəqiqlik", "ədəbi axın" haqqında elm kimi dərk olunmuşdur. Üslubiyyat bir elm kimi üslublar haqqında nəzəriyyə olub, fikrin sözlə ifadəsini, daxili aspektini öyrənir. Bu baxımdan, üslubiyyat ədəbiyyat və dilin kəsişməsində özünü reallaşdırır. Hətta tədqiqatçılar üslubiyyatı iki yer ayırırlar: linqvoüslubiyyat və ədəbiyytşünaslıq üslubiyyatı. Təbii ki, burada üslubiyyat iki müxtəlif aspektdə nəzərdən keçirilir: birinci halda dil vasitələrindən istifadə üslubu kimi; ikinci halda fərdi bədii yaradıcılıqda fikrin obrazlı – emosional tərzdə ifadə edilməsi kimi.

V.Vinoqradov üslubiyyatı nəzərə alaraq, onun 3 əsas tədqiqat sahəsini müəyyənləşdirir:

1) "Sistemlər sistemi" olan dil üslubi və ya struktur üslubiyyat (danışıq, elmi, işgüzar, publisist, rəsmi-kargüzar) və s.

2) Şifahi və yazılı nitqin müxtəlif semantik və ekspressiv xarakterli janrlarının xüsusiyyətlərini öyrənən nitq üslubiyyatı;

3) Bədii ədəbiyyatın üslubiyyatı - bədii əsərin bütün elementlərinin üslubunu, yazıçının fərdi üslubunu öyrənən bədii üslubiyyat (9, s. 210).

Bədii əsərlərdə üslubi məqsədlərlə istifadə olunan vasitələrdən biri fonetik dialektizimlərdir. Fonetik dialektizimlərdə özünü göstərən fonetik-üslubi hadisələr içərisində incələşmə və qalınlaşma, samit və saitlərin əvəzlənməsi, səs düşümü və ya artımı bədii əsərlərdə kolorit yaratmaq üçün istifadə edilən əsas üsullardandır. Alınma sözlərin dialektlərdə təhrif olunaraq tələffüz edilməsi faktından yazıçılar öz əsərlərində surəti tipikləşdirmək, komik effekt yaratmaq məqsədilə istifadə edirlər.

Bədii ədəbiyyatda surətlərin nitqini tipikləşdirmək məqsədilə kəkələmənin müxtəlif üslubi xüsusiyətlərindən istifadə olunur:

1) Qəhrəmanın pəltəkliyini göstərmək üçün;

2) Müəyyən hiss-həyəcanı vermək üçün;

3) Müəyyyən xəstəliklə əlaqədar yaranan nitq qüsurunu vermək üçün;

4) Uşaq nitqinin spesifikasını açmaq üçün və s.

Bunların hər birinin meydana çıxma səbəbi və formaları fərqlidir. Hər hansı səsin deyilməməsi *(ha-dan yadıma düşdü?);* daxili kəsilmələr, uzanmalar və ya təkrarlanmalar *(ba... bam gəl... mədi, yo... yoldaş, deee... yirsən)*; müəyyən səslərin təkrarlanması *(hmmm)* və s. forma və vəziyyətdə kəkələmələr vardır. Daha çox uşaq ədəbiyyatında olan kəkələmələr uşaq danışığının şirinliyini verməyə xidmət edir.

Lakin ingilis ədəbiyyatşünaslığında üslubi məqsədlərlə işlənmiş dilektizimlər arasında cənub dialekti də əhəmiyyətli yer alır.

İngilis və Azərbaycan dillərində ekspressivliyi artıran, fikrin dəqiq, daha dolğun, canlı çatdırılmasını təmin edən bir çox üslubi vasitələr mövcuddur. İ.R.Qalperin, V.V.Vinoqradov və başqa dilçilər ingilis dilindəki bütün üslubi fiqurları məcazlara - leksik vasitələrə və danışıq fiqurlarına - sintaktik vasitələrə ayırırlar. Azərbaycan dilində bədii təsvir və bədii ifadə vasitələri müvafiq olaraq məcazlar və danışıq fiqurlarına uyğun gəlir.

Leksik səviyyədə üslubi vasitələr mətndə mənanın sabitləşməsini təmin edir. Sözlərin ilkin mənalarından əlavə törəmə mənaları da vardır. Sözlərin denotativ və konnotativ mənaları fərqləndirilir. Konnotativ məna məcazi mənaya yaxındır. Denotativ məna sözün ilkin mənası, konnotativ məna isə sözün yaratdığı assosiasiyalarla əlaqəlidir. Məsələn: /player/ "oyunçu" sözünə diqqət yetirək.

/The soccer goalie was a real player/

"Futbol qapıçısı əsl oyunçu idi" cümləsində oyunçu mənasında anlaşılır.

/She is a good player in relationship/

"O, münasibətdə yaxşı oyunçudur" cümləsində isə digərlərindən istifadə edən şəxs mənasında konnotativ məna yaranır.

Sözlərin mənasıdan istifadə edərək yazıçı epitet, metafor, metonimiya, cinas, zevqma kimi bir sıra üslubi vasitələr yaradır.

B.Vahabzadənin "Vaxt" şeirindəki *zaman at çapar* metaforunun istifadəsi vaxtın necə tez keçdiyini obrazlı və müqayisəli ifadə edir. Oxucu bir anlıq şeirin sehrinə dalır. Aşağıdakı misala baxaq:

"Saçlarımın ağlığında, alnımın qırışında
Zaman necə at çapır, yüyəni öz əlində" (6).

Sözlərin kontekstdə əlavə məna ifadə etməsi onların kontekstual mənasıdır. Lüğəvi və kontekstual məna əsasında metafor, metonimiya, ironiya, əsas və törəmə məna əsasında zevqma və cinas, məntiqi və emotiv məna əsasında epitet və oksimora, məntiqi və nominativ məna əsasında antonamasiya formalaşır. Yazıçılar bu fiqurlardan fikrin, düşüncənin daha təsirli, müqayisəli ifadəsi üçün bədii mətnlərdən istifadə edirlər.

Misal üçün C.Barners fikri daha təsirli ifadə etmək üçün təkrardan istifadə edir:

She worked out how many weeks before the Show to plant her seed, pushed in the beans, watered them, waited, weeded, watered, weeded, lifted clumpy bits of soil away from where they might be coming up, saw the glistening, whippy sprouts break from the soil, encouraged the tendrils in their spiraling climb, saw the red flowers from and break, watered just us the tiny pods appeared watered, weeded, watered and there, an exact few days, before the Show, she had seventy-nine Climbing Beans Round to Choose from (11, s. 19).

Verimiş nümunədə yazıçı waited, weeded, watered sözlərini təkrarlamaqla toxumun böyüməsi üçün çəkilən əziyyəti oxucuya daha canlı şəkildə çatdırır. C.Barners "İngiltərə, İngiltərə" əsərində bənzətmələrdən istifadə edir və mətni daha çox emosional edir:

"Then there was Kent pointing its finger or its nose out at the Continent in warning – careful, foreigners over there; Oxfordshire playing spoons with Buckinghamshire and squashing Berkshire flat: Nottinghamshire and Derbyshire like side-by-side carrots or pine-cones; the smooth, sea-lion curve of Cardigan" (11, s. 5).

Dildə obraz yaradan vasitələr arasında dilin leksik səviyyəsi də əhəmiyyətli rola malikdir. Dilin obraz yaradan vasitələri arasında leksik-üslubi vasitələrin də öz yeri vardır. Leksik-üslubi vasitələrdən *epitet* yunan sözü olub, əlavə deməkdir. Bədii əsərlərdə mənanı qüvvətləndirmək üçün, müəyyən bir cəhəti diqqətə daha qabarıq çatdırmaq üçün epitetlərdən istifadə olunur. Epitetin əsas xüsusiyyəti cümlədə təyin rolunda olmasıdır. Bu təyinlər adətən məcazi mənada olur. Təyinedici xüsusiyyətinə görə epiteti bədii təyin də adlandırırlar. Misal üçün müqayisə edək:

Qara bəxtim oyanmazmı?
və yaxud
Qara saçlı gözəl

Birinci cümlədəki *qara* sözü məcazi mənada işləndiyi üçün epitetdir. İkinci cümlədəki *qara* sözü isə həqiqi mənada işləndiyi üçün epitet deyildir.

Klassik ədəbiyyatda işlədilən "Homer" epiteti iki sözün birləşməsindən yaranan mürəkkəb söz kimi tanınır. Məsələn: fleet-footed Achills - sürətli ayaqlı (donanma ayaqlı Axilles); Cow-eyed Hera - "inək gözlü Hera"; the wine-dark sea – "şərab kimi qaranlıq dəniz" və s.

She walks in beauty, like the night
Of cloudless climes and starry skiess;
Where thoughts serenely sweet express,
So soft, so calm, yet eloquent,
The smiles that win the tints that glow.

İngilis poeziya ənənəsi üçün alliterasiyanın əhəmiyyəti çoxdur. Hələ iddia edilir ki, hind-sakson şeir aləmi "allit" üzərində qurulmuşdur. Qafiyə kimi, alliterasiya ölçüsü də kompozisiyanı yaradan priyom rolunu əks etdirir. Bu zaman hər sətirdə dövrü vurğu olur və vurğu arasında hecaların sayı daha sərbəst olur. Qeyd edək ki, alliterasiya sezura ilə uyğunlaşır. Sezura şeirin vacib ölçüsü kimi müəyyən edilir. Sezurada sətir hərəsində iki vurğu olan iki yerə bölünür. İkinci yarımşeirin birinci vurğulu hecası birinci yarımşeirin bir və ya iki vurğulu hecası ilə qafiyyələnir. Hind-sakson poeziyasındakı alliterasiyanı ilkin qafiyənin xüsusi növü kimi səciyyələndirir. O yazır ki, bu cür embrional qafiyə müntəzəm hesab edilmir. Sezur qafiyə təqribi və əsasən yarım şeirin ortasında və axırında çıxış edir.

Alliterasiyanın sezur qafiyə ilə bəzən dəqiq, bəzən isə təqribi birləşdirilməsi təmin edilməlidir. Qeyri-müntəzəm sezur qafiyəni əks etdirmək üçün aşağıdakı parçanı nəzərdən keçirdək:

*But let us ponder boldly: "tis a basr*
*Abandonment of reason to resign*
*Our right of thought, our last and only place*
*Of refuge; this, at least, shall still be mine:*
*And bred in darkness, lest the truth should shine*
*To brightly for the unprepar'ed mind.*

Hərfi tərcüməsi:

*Gəlin cəsarətlə düşünək ki, "bu əsas hesab edilir*
*İstefa etmək üçün səbəb axtarmaq*
*Düşüncə haqqımız, son və yeganə yerimiz*
*Sığınacağımız; bu ən azı mənimki olacaqdır.*

Bədii mətnlərdə canlı və obrazlı nitqin emosionallığını artıran, müqayisə ilə obrazların və xarakterlərin keyfiyyətləri və xüsusiyyətləri haqqında canlı təsəvvür yaradan və oxucuya güclü təsir bağışlayan üslubi fiqur antiteza adlanır. Ədəbiyyatda yazıçılar yalnız cümlələrdə deyil, xarakterlərdə və hadisələrdə də antitezalar tətbiq edirlər. Məsələn: Çarlz Dikkensin "İki şəhərin hekayəsi" (A Tale of Two Cities) adlı romanı unudulmaz antiteza nümunələri ilə zəngindir.

It was the best of times. It was the worth of times. It was the age of wisdom. It was the age of foolishness. It was the epoch of belief. It was the epoch of incredulity, it was the season of Light, it was the season of Darkness, it was the spring of hope, it was the winter of despair, we had everything before us, we had nothing before us, we were all going direct to Heaven, we were all going direct the other way (Charles Dickens).

Sözün mənasının köçürülməsi ilə yaranan bədii ifdə vasitələrindən biri metaforadır. Metafora iki obyekt arasında oxşarlıq və ya oxşar bənzərliyə əsaslanan köçürmə mənasını ifadə edir. Metaforadan istifadə zamanı yalnız əşyalar deyil, həmçinin də hadisələr, hərəkətlər, keyfiyyətər də müqayisə oluna bilər. Məsələn:

Juliet is the sun.

Culyetta günəşdir.

Mənanın genişlənməsi nəticəsində metafora metanimiyaya çevrilir və o metafora kimi konseptuallaşma prosesində iştirak edir. Məsələn:

“Then they came in. Two of them, a man with long fair moustaches and a silent dark man… Definitely, the moustache and I had nothing in Common” (Doris Lessing “Retread to Innocence”).

Bu nümunədə “the moustache” (bığ) sözü “a man” sözünün əvəzinə işlənmişdir və sözügedən insanın xarici görkəminin bir xüsusiyyətini bildirir. Danışan şəxs də həmin insanla birinci dəfədir ki, rastlaşır.

## Nəticə

Beləliklə, apardığımız tədqiqatlar bizə deməyə imkan verir ki, hər bir dil səviyyəsinə uyğun olan vasitələr mətnin üslubuna uyğun seçilir və onun üslubi dəyərini artırır. Mətnin formalaşmasına üslubi vasitələr güclü təsir edir. Üslubi vasitələr dil səviyyələrinə görə qruplaşdırılır və fikri aid olduğu səviyyəyə uyğun olaraq ifadə edir. Aparılan tədqiqat əsasında məlum oldu ki, mətnləri üslubi vasitələrsiz təsəvvür etmək mümkün deyil. İstənilən mətn də üslubi vasitələrdən ibarətdir. Onlardan nə dərəcədə çox istifadə isə mətnin yazıldığı üslubdan asılıdır. Üslubi vasitələrin istifadəsi isə fikrin ifadəsini daha emosional, daha qüvvətli edir. Leksik səviyyədə üslubi vasitələr mətndə mənanın sabitləşməsini təmin edir. Bu vasitələr də fikrin daha dərin çalarda ifadəsinə dəlalət edir.

Üslubi vasitələr bir çox tədqiqatçıların diqqət mərkəzində olmuşdur. Üslubi vasitələrin təhlili əhəmiyyətlidir, çünki hər bir mətn üslubi vasitələrlə daha çox zənginləşir və təsiredici xarakter alır.

## Ədəbiyyat

1. Abdullayev N.Ə. Nitq mədəniyyətinin əsasları. Dərs vəsaiti. Bakı, 2013.
2. M.Azad Studies in text and discourse. England, Cambridge Scholars, 2018, 150 p.
3. Dəmirçizadə Ə. Müasir Azərbaycan dili. Bakı, Şərq-Qərb, 2007, 256 s.
4. Tanrıverdiyeva Ə.V. “Kitabi-Dədə Qorqud”da şəxs adları. Bakı, “Elm”, 1999, s. 62-63.
5. Məmmədov A. Mətn dilçiliyi. Mürkkəb sintaktik bütöv. Bakı, 2001, 56 s.
6. Şıxıyeva İ. “Kitabi-Dədə Qorqud” dastanının linqvostatik xüsusiyyətləri.
7. Vahabzadə B. Axı dünya fırlanır. Bakı, “Yazıçı”, 1987, 208 s.
8. Арнольд И.В. Стилистика современного английского языка (стилистика декодирования). Ленинград: «Просвещение», 1973, с. 225-241.
9. Виноградов В.В. О языке художественной прозы: Избр. Труды. М.: «Наука», 1980, 360 с.
10. Виноградов В.В. Стилистика. Теория поэтической речи. Поэтика. Москва: «АН СССР», 1965, с. 5.
11. Barners J. England, England. London: Vintage books, 2012, 226 p.
12. Khadjieva D., Seytyanov J, Erimbetova E. “Seminars in Stylistics”. Nukus, Karakalpakstan, 2009, 128 p.
13. Mehriban Huseynova, Günel Yunusova. English stylistics. “Elm və təhsil”, Bakı, 2019.
14. Seboon T. Style in Language. Cambridge: Cambridge University Press, 1960, 488 p.

**Rəyçi: dos. M.Hüseynova**

Göndərilib: 20.08.2020 Qəbul edilib: 21.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/91-94

**Səkinə Mirheydər qızı Seyidova**
Bakı Dövlət Universiteti
seyidova.s87@gmail.com

# UĞURSUZ AİLƏLƏRDƏ BÖYÜYƏN YENİYETMƏLƏRİN UĞURLU GƏNCLİYƏ KEÇİDİNİN ÇƏTİNLİKLƏRİ

**Xülasə**

Yeniyetməlik, uşaqlıqdan yetkinliyə kəskin bir keçid ilə xarakterizə olunur. Bir tərəfdən şəxsiyyətin quruluşundakı mənfi təzahürlər, uyğunsuzluqlar, uşağın əvvəllər qurulmuş maraqlar sisteminin məhdudlaşdırılması, digər tərəfdən isə böyüklərə münasibətdə davranışının dəyişməsi bu çətin dövrün göstəricisidir. Digər tərəfdən, yeniyetmələrin həyatı bir çox müsbət amillərlə də xarakterizə olunur: uşağın müstəqilliyi artır, digər uşaqlar və böyüklər ilə münasibətlər daha müxtəlif və mənalı olur, fəaliyyət sahəsi xeyli genişlənir və s. Ən əsası, bu dövr uşağın keyfiyyətcə yeni bir sosial mövqeyə girməsi ilə xarakterizə olunur və yeniyetmə cəmiyyətin bir üzvü olaraq özünə şüurlu münasibət formalaşdırır. Eyni zamanda, uğursuz ailələrdə böyüyən uşaqlar yeniyetməlik dövründən gəncliyə keçiddə bir sıra problem və çətinliklərlə üzləşirlər. Bu hallara biqanə yanaşılsa, onlar düzgün olan yoldan dönə, o yolu itirə bilərlər.

***Açar sözlər:*** *valideynlər, yaş, yeniyetməlik dövrü, qadağa, münaqişələr, uşaqlar*

## Difficulties of teenagers growing up in failure families to successful youth

**Summary**

Adolescence is characterized by a sharp transition from childhood to adulthood. On the one hand, the negative manifestations in the structure of the personality, inconsistencies, the restriction of the child's previously established system of interests, the nature of his behavior towards adults are indicators of this difficult period. On the other hand, adulthood is characterized by many positive factors: the child's independence increases, relationships with other children and adults become more diverse and meaningful, his field of activity expands significantly, and so on. Most importantly, this period is characterized by the fact that the child enters a qualitatively new social position, where a conscious attitude to himself as a member of society is formed. At the same time, children growing up in unsuccessful families face a number of challenges and difficulties during the transition from adolescence to adolescence. When left unmanaged, they can be left astray and lose the right path.

***Key words:*** *parents, age, adolescence, forbid, conflicts, children*

## Giriş

Yeniyetməlik dövrü – uşaqlıq və yetkinlik arasında müəyyən bir keçid dövrüdür. Adətən yeniyetməlik uşaqlıq və yetkinlik dövrü arasında bir mərhələ olaraq görülür və hər kəs onu fərqli vaxtlarda və müxtəlif formada keçirdir, lakin bütün bu fərqliliklərə baxmayaraq sonda əksər yeniyetmələr yetkinlik mərhələsinə çatmış olur. Bu mənada, yeniyetməlik, məsuliyyətli və yaradıcı bir yetkin olmaqdan əvvəl hər kəsin keçməli olduğu uşaqlıq və yetkinlik arasında atılan körpüyə bənzədilə bilər.

Yeniyetməlik, uşaqlarda nisbətən sakit böyümə dövrünü əvəz edən sürətli və olduqca ziddiyyətli bir inkişaf dövrüdür. Bu zaman həm fiziki, yəni yeniyetmənin bədənində, həm də psixikasında əhəmiyyətli dəyişikliklər baş verir ki, bu da uşaq şəxsiyyətinin formalaşmasında son dərəcə vacib rol oynayır. Fransız filosofu J.J.Russonun, yeniyetməlik dövrünü "ikinci doğuş" adlandırması da təsadüfi deyil (Минияров, 2000: 178).

Müasir yeniyetməliyin təsvirini L.S.Vıqotski, I.S.Kon, D.B.Elkonin və L.I.Bojoviç və başqa alimlər vermişlər (Реан, 2002: 12). Bu tədqiqatlar L.S.Vıqotski-nin mədəni və tarixi konsepsiyasına uyğundur. Vıqotski yetkinlik dövründə alovlanan maraq probleminin bir yeniyetmənin psixoloji və sosial inkişafının bütün problemlərinin açarı olduğunu qeyd edir. Beləliklə, həssaslığın, neqativliyin, uşağın aqressivliyinin artmasının səbəblərini L.I.Bojoviç, ünsiyyət ehtiyacının düzgün şəkildə ödənilməməsi ilə bağlayır (Bojoviç, 1968: 25).

Yeniyetməlik dövrü 11-12 yaşdan 15-16 yaşadək uşaqların inkişaf dövrü hesab olunur; bu, uşağın sosial fəaliyyətinin sürətli inkişafı və yenidən qurulması ilə əlamətdardır. Yeniyetmələrin fiziki inkişafı sürətli böyümə, çəki artımı, əzələ inkişafı, skeletin ossifikasiyası, yüksək təzyiq, yorğunluq, başgicəllənmə, beyin və sinir sisteminin inkişafı ilə xarakterizə olunur. Bu, əlbəttə ki, bədən üçün çox bir yükdür və üstəlik buna cinsi istəkə səbəb olan cinsi yetkinlik də əlavə olunur.

Eyni zamanda bu dövrdə fiziki inkişafla yanaşı mənəvi inkişaf da davam edir, yeniyetmənin inancları və istəkləri formalaşır. Bu dövrdə meydana gələn və formalaşan, inanclar daha çox ictimai rəylə üst-üstə düşmür. Bu, uşağın özünü bir şəxsiyyət kimi düşünməsinə, özünütərbiyyə prosesinə aparan dövrdür. Bu zaman xarakterinin formalaşması başlayır, yeniyetmə özünü ətrafındakı həmyaşıdları ilə müqayisə edir, başqa sözlə, yeniyetmələrin sosiallaşması prosesi gedir.

Şəxsiyyətlərarası münasibətlərin ən vacib, ən universal cəhətlərindən biri uşaqlıq və gəncliyin sosiallaşmasıdır. "Sosiallaşma" termini şəxsin cəmiyyətin tam üzvü kimi fəaliyyət göstərməsinə imkan verən müəyyən bir bilik, norma və dəyərlər sistemini mənimsədiyi və təkrar istehsal etdiyi bütün sosial proseslərin məcmusunu ifadə edir. Sosiallaşma həm cəmiyyətin, həm də fərdin həyatında mühüm rol oynayan, sosial həyatın özünün çoxalmasını təmin edən bir prosesdir (Мухина, 1999: 68).

Sosiallaşma yalnız şüurlu, idarəedici, məqsədyönlü təsirləri deyil, həm də şəxsiyyətin formalaşmasına təsir edən kortəbii prosesləri də əhatə edir. Yetkinlik dövründə uşağın həyatının bütün sahələrində güclü dəyişikliklər olur, təsadüfi deyil ki, bu yaş uşaqlıqdan yetkinliyə qədər "keçid" adlanır, lakin bir yeniyetmə üçün yetkinlik yolu yeni başlayır və bu dövr bir çox dramatik təcrübə, çətinlik və böhranlarla zəngindir. Bu zaman sabit bir davranış formaları, xarakter əlamətləri və emosional reaksiya metodları formalaşır ki, bu da gələcəkdə böyüklərin həyatını, fiziki və əqli sağlamlığını, sosial və şəxsi yetkinliyini müəyyənləşdirir. Bir yeniyetmənin şəxsiyyətinin sağlam inkişafına töhfə verən şəraitin təmin edilməsində ailə mühitinin və məktəb kollektivinin rolu olduqca vacibdir (Фельдштейн, 1989: 106).

E.Şpranger yetkinliyi mədəni və mənəvi baxımdan tədqiq etmişdir. Yetkinlik dövründəki inkişaf xüsusiyyətləri mədəniyyət və tarix dünyasına daxil olan fərdin inkişafının daxili qanunları əsasında izah edildi. Yetkinliyin məzmunu, E.Şprangerə görə, bir insanın mədəniyyətə, müəyyən bir dövrün ruhuna uyğun böyüməsidir (Шнейдер, 2005: 196). Yeniyetmələrin yetkinlik dövrünə keçməsinin müxtəliflikləri, bu keçid dövründə meydana gələn çətinliklər psixologiyada və sosiologiyada geniş tanınmışdır.

E.Şpranger yeniyetməlikdən gəncliyə keçidin əsas üç növünü təsvir etmişdir.

● Birinci növ - kəskin, fırtınalı, böhranlı bir dövr ilə xarakterizə olunur, yeniyetmənin “ikinci doğuş” kimi yaşadığı, bunun nəticəsində yeni bir “mən” meydana gətirir.

● İkinci növ - yeniyetmənin öz şəxsiyyətində dərin və ciddi dəyişikliklər etmədən yetkinlik həyatına qoşulması, yavaş-yavaş böyüməsidir.

● Üçüncü növ - yeniyetmənin özü fəal və şüurlu şəkildə özünü formalaşdırdığı və tərbiyə etdiyi, iradə daxili narahatlıq və böhranların öhdəsindən gəlmək üçün şəxsi inkişaf prosesidir. Bu, özünü idarəetmə və özünü tərbiyə etmək səviyyəsi yüksək olan yeniyetmələr üçün tipikdir (Эйдемиллер, Юстицкис, 1999: 32).

Yeniyetmələrin qarşılaşdıqları əsas problemlərdən biri valideynlərlə olan qarşılıqlı münasibətlər problemidir, çünki yetkinlik bütün ailə üzvlərinin sosial, şəxsi və yetkinlik meyarlarına görə böhranlar və qarşıdurmalarla davam edən vaxtıdır. Bu dövrdə bütün gizli ziddiyyətlər ortaya çıxır (Хорни, 2008: 64).

Yeniyetməliyin əsas məzmunu onun uşaqlıqdan yetkinliyə keçməsidir. İnkişafın bütün aspektləri keyfiyyətcə yenidən qurulmaqdadır. Bu çevrilmə prosesi yetkin yaşlı uşaqların şəxsiyyətinin bütün əsas xüsusiyyətlərini müəyyənləşdirir.

Yeniyetmə valideynləri ilə fikir ayrılığı yaşamağa, üzləşməyə başlayır. Əsasən uğursuz ailələrdə böyüyən uşaqlar bu keçid dövründə valideyinləri və həmyaşıdları ilə daha kobud, sərt ola bilər, digər yetkinləri haqsız yerə tənqid edə bilərlər (Bronfenbrenner, 2012: 98). Uğursuz ailələrdə əvvəllər uşağın daxilində baş verən böhranları görməyən, ailədə emosional istilik yaratmayan valideyinlər üçün uşaqların istəklərini və fikirlərini anlmaq get gedə çətinləşir.

Bu baxımdan, ən uğurlu ailələrdə belə, yeniyetmə uşaqları ilə ünsiyyətdə müəyyən çətinliklər yaranır. Bununla belə natamam və uğursuz ailələrdə böyüyən yeniyetmələrlə münasibətlərdə mürəkkəblik artır, çünki valideynlər çox vaxt böyüyən uşaqlar ilə ünsiyyətin kiçiklərlə müqayisədə fərqli qurulmalı olduğunu başa düşmürlər. Valideynlər çox vaxt nəyin qadağan olunmalı və nəyə icazə verilməli olduğunu ayırd etmirlər. Bütün bunlar çox çətin, münaqişə vəziyyətini yarada bilər.

Ailə konteksti bir yeniyetmənin şəxsiyyətlərarası münasibətlərinin formalaşmasına və bütün fəaliyyətinə əhəmiyyətli dərəcədə təsir göstərir. Uşaq və valideynlər arasındakı qurulmuş sağlam və dəstəkləyici bir əlaqə, məktəbdən kənarda, eləcə də məktəbdəki müvəffəqiyyətlərini təyin edir (Фрейд, 2003: 54). Bu eyni zamanda həmyaşıdları və digər böyüklər ilə səmərəli ünsiyyət üçün olduqca vacibdir.

Qarşılıqlı anlaşma və qarşılıqlı maraq əsasında ünsiyyət nəticə vermirsə, o zaman istər-istəməz rəsmi, gündəlik xarakter alır. Valideynlər uşaqların həyatındakı formal-rol vəziyyətlərinə (davranış, akademik performans) nə qədər “təzyiq edirlər”, bir o qədər mövcud münasibətlər “formal” xarakter daşımağa başlayır (Синягина, 2003: 11). Nəzərə almaq lazımdır ki, uşaq-valideyn münasibətləri rəsmiyyətdən uzaq olmalı, təbii halda baş tutmalıdır. Ən kədərli hal uğursuz ailələrdə yetkinləşən yeniyetmələrdə valideynlər və uşaqlar

arasında görünməz bir anlaşılmazlıq və yadlaşma divarının göründüyü haldır. Bu şəraitdə valideynlərin hətta ədalətli və əsaslandırılmış tələbləri yeniyetmələr tərəfindən subyektiv olaraq haqsızlıq kimi qəbul edilir. Bu tələblər valideynlər tərəfindən xüsusi təsnifatlar şəklində və isterik şəkildə ifadə olunursa, və "uşaq" ın artıq ailədə bərabər ünsiyyətə hazır olduğunu görməkdən yayınırlarsa, yeniyetmələr üçün bu cür "ədalət" ilə razılaşmaq daha da çətinləşir.

Yeniyetməlik dövründən gəncliyə keçid mərhələsində uğursuz ailələrdə böyüyən həm uşaqların, həm də onların valideynlərinin bir-birlərinə qarşı tez-tez uyğunsuzluq nümayiş etdirdiklərini söyləmək lazımdır. Böyüməkdə olan uşaqlar özünə hörmət və yeni hüquqların verilməsini tələb edir, lakin yetkin bir şəxsin statusu ilə əlaqədar vəzifələrə gəldikdə, valideyinlərin davranışı bu tələbləri özündə əks etdirmir.

Qeyd etmək lazımdır ki, bu dövrdı meydana gələn başlıca problemlərdən biridə valideynlərin bir qayda olaraq yeniyetmələrin gəncliyə keçid dönəmində xarici görünüşlərinə qayğı göstərməklərini, onların bir şəxsiyyət kimi müstəqil olmaq istədiklərini başa düşmürlər. Bu, öz şəxsiyyətini tapmaq və ifadə etmək və müəyyən bir sosial qrupa aid olmağın ehtiyacının təzahürüdür. Geyim və xarici görünüş özünü ifadə etmə üsuludur və gənclər başqalarına aid təəssüratları idarə etməyə meyllidirlər. Geyim köməyi ilə insan həyatda oynamaq istədiyi rol barədə başqalarına məlumat verə bilər.

Ədədbiyyatda uğursuz ailələrdə böyüyən yeniyetmələrdə gəncliyə keçid mərhələsində münaqişələrə səbəb olan əsas amillər aşağıdakı kimi təsnifatlandırılmışdır:

**Ailədaxili münasibətlərin növü.** Ailə münasibətləri harmonik (ahəngdar) və disharmonik (uyğunsuz) növlərə ayrılır. Harmonik bir ailədə, hər bir ailə üzvünün psixoloji rollarının dizaynında, "Biz" ailənin formalaşmasında, ailə üzvlərinin ziddiyyətləri həll etmək qabiliyyətində özünü göstərən tarazlıq qurulur. Uygunsuz ailələrdə daxildəki boşluq ər-arvadın ziddiyyətli qarşılıqlı münasibətlərində ifadə olunan ailə münasibətlərinin mənfi təbiətidir. Belə bir ailədəki psixoloji stressin səviyyəsi artmağa meyllidir, üzvlərinin nevrotik reaksiyalarına, uşaqlarda daimi narahatlıq hissinin yaranmasına səbəb olur.

**Ailədaxili münasibətlərin pozulması.** Destruktiv tərbiyənin aşağıdakı xüsusiyyətləri fərqləndirilir:

* Təhsil məsələsində ailə üzvləri arasında fikir ayrılıqları;
* Uyğunsuzluq, ziddiyyət, məntiqsizlik;
* Yeniyetmə həyatının bir çox sahəsindəki qəyyumluq və qadağalar;
* Yeniyetmələrə artan tələblər, təhdidlərdən, məhkumluqlardan tez-tez istifadə edilməsi.

**Uşaqların yaş böhranları.** Bu böhranlar onların artan münaqişəsinin amilləri kimi qəbul edilir. Yaş böhranı, uşaqlıq inkişafının bir mərhələsindən digərinə keçid dövrüdür. Kritik dövrlərdə uşaqlar itaətsiz, şıltaq, əsəbi olurlar. Onlar tez-tez başqaları ilə, xüsusən də valideynləri ilə münaqişəyə girirlər. Əvvəl yerinə yetirilən tələblərə mənfi münasibət bəsləyirlər, inadkarlıq nöqtəsinə çatırlar.

Yetkinlik dövründən gəncliyə keçid mərhələsində uşağın davranışının tipologiyası, valideynlərin istifadə edəcəyi tərbiyə üsulundan asılı olaraq əvvəlcədən proqnozlaşdırıla bilər. Ailədəki tərbiyə üslublarını təhlil edərkən yetkin şəxsin şəxsiyyət əlamətlərində özünü göstərən müəyyən nümunələrin olduğunu nəzərə almaq lazımdır.

## Nəticə

Natamam və uğursuz ailələrdə formalaşan uşaqlarda bünövrəsi uşaq yaşlarından qoyulan narahatlıq və həyəcanlar yeniyetməlikdən gəncliyə keçid dövründə özünü daha qabarıq şəkildə büruzə verir. Getdikcə dərinləşən problemlər, valideyin-övlad arasında emosional bağın zəifliyi və ya tamamilə mövcud olmaması, ailədə valideyinlərdən birinin dominantlığı, valideyinlər arasında baş verən münaqişələr və problemlər, anlayış qayğı və sevgi yetərsizliyi, heddindən artıq qoyulan tələblər və.s kimi hallar yeniyetmənin bir şəxsiyyət kimi inkişaf etməkdə olarkən bir çox problemlər yaşamasına səbəb olur. Bu kimi hallar uşağın özünə qapanmasına, özgüvən əksikliyinə, zəif sosiallaşmaya, bir sözlə yeniyetməlikdən gəncliyə keçid dövründə uğurlu gələcəyə keçidini çətinləşdirir.

## Ədəbiyyat

1. Bojoviç L.I. Şəxsiyyət və onun uşaqlıq dövründə formalaşması. Bakı, 1968, 25s;
2. Фельдштейн Д.И. Психология развития личности в онтогенезе. М., 1989, 106 с;
3. Минияров В.М. Психология семейного воспитания. Воронеж, 2000, 178 с;
4. Мухина В.С. Возрастная психология. М.: Академия, 1999, 68 с;
5. Реан А.А. Подросток. СПб.: Питер, 2002, 12 с;
6. Синягина Н.Ю. Психолого-педагогическая коррекция детско-родительских отношений. М.: Гуманит. изд. центр ВЛАДОС, 2003, 11 с;

7. Шнейдер, Л.Б. Семейная психология: Учебное пособие для вузов. М.: Академический Проект, 2005, 196 с;
8. Эйдемиллер Э.Г., Юстицкис В. Психология и психотерапия семьи. СПб.: Питер, 1999, 32 с;
9. Фрейд А. Нормальность и патология в детстве. «Плэйт», 2003, 54 с;
10. Хорни К. Невроз и рост личности. М. Академический проект, 2008, 64 с;
11. The developing person through childhood (6th edition) Bronfenbrenner, U New York, NY: Worth Publishers. 2012, 98 p.

**Rəyçi: dos. S.Əliyeva**

Göndərilib: 16.08.2020 Qəbul edilib: 18.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/95-97

**Könül Akif qızı Xudazadə**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
Konul.akbar.31@gmail.com

# MÜASİR DÖVRDƏ MÜƏLLİM PEŞƏSİNƏ HAZIRLIĞIN BƏZİ MƏSLƏLƏRİ VƏ PERSPEKTİVLƏRİ

**Xülasə**

Bu gün müəllim hazırlığının həyata keçirilməsi üçün vacib olan məqamlardan biri pedaqoji fəaliyyətin real problemlərinin effektiv həllinə nail olmaqdır. Pedaqogikanın psixolojiləşdirilməsi əvəzinə pedaqoji psixologiyanın pedaqojiləşdirilməsinə çalışmaq lazımdır. Bununla yanaşı təhsilin forma və məzmununda müəllim hazırlığının prinsiplərini və metolodoloji aspektlərini yenidən işləmək zərurəti vardır. Azərbaycanda mövcud kurrikulum sistemi bunu zəruri edir. Müəllim hazırlığında pedaqoqun psixoloji kompitentliyinin araşdırılması bu problemin həllində əhəmiyyətli addımlardan biri ola bilər.

Firkimizcə, müəllim peşəsinə hazırlığın tədqiqi istiqamətləri genişləndirilməli, müasir müəllim peşəsinin psixopedaqoji srtukturu, ona verilən tələblər, müəllim peşəsinin seçiminin psixopedaqoji amilləri, tələbələrin peşə şüurunun və müəllim peşəsinə hazırlığının motivləri, eləcə də müəllim peşəsinə yiyələnmədə özünüaktuallaşdırma amili kimi məsələlər araşdırılmalıdır. Bununla yanaşı tələbələrin müəllim peşəsini seçiminin əsas motivasiya istiqamətlərini müəyyən etmək, mövcud sistemdən çıxış edərək müəllim hazırlığında bu məsələləri nəzərə almaq zəruridir.

***Açar sözlər:*** *müəllim hazırlığı, perspektivlər, psixopedaqoji məsələlər*

## Some questions and perspectives of teacher training in modern times

**Summary**

One of the most important aspects in the implementation of pedagogical training is the solution of real problems of pedagogical activity. Instead, since psychology has become an integral part of pedagogy, it is necessary to try to study educational psychology. At the same time, there is a need to develop principles and methodological aspects of teacher training in the form and content of teaching. This requires an existing curriculum system in Azerbaijan.

Studying the psychological competence of a teacher in teacher training can be one of the most important steps in solving this problem.

In our opinion, it is necessary to expand the research areas of pedagogical training, as well as the psychological and pedagogical structure of the modern pedagogical profession and the requirements for it. In the context of this expansion, the psychological and pedagogical factors of choosing the profession of a teacher, the motives of the professional consciousness of students and pedagogical training, and the factors of self-actualization should be studied and investigated.

At the same time, it is necessary to determine the main directions of motivating students to choose the profession of a teacher, and take these issues into account when training teachers on the basis of the existing system.

***Key words****: preparing teacher, perspectives, psychopedagogical tasks*

## Giriş

Məlumdur ki, tələbələrin müəllim peşəsinə hazırlığın psixopedaqoji məsələləri müasir dövrdə daha çox aktuallıq kəsb etməyə başlamışdır. Problemin aktuallıq kəsb etməsi bir tərəfdən cəmiyyətin inkişafı ilə bağlı olan fasiləsiz təhsil sisteminin yaradılması, digər tərəfdən isə inteqrasiya proseslərinin güclənməsi və vahid təhsil məkanın yaradılması ilə bağlı meqameylərin üstünlük təşkil etməsi ilə əlaqədardır.

Təhsilin modernləşdirilməsi, demokratikləşdirilməsi və humanistləşdirilməsi ilə bağlı vəzifələrdə müəllim hazırlığı öncül yerlərdən birini tutmaqla yanaşı, həm də cəmiyyətə yararlı, çevik düşünən, yeni şəraitə adaptasiya qabiliyyəti yüksək olan, geniş dünyagörüşlü, akademik və təşkilati bacarıqlara malik müəllimlərin hazırlanmasını diktə edir. Məktəb təhsilinin, müəllimin fəaliyyətinin yenidən formalaşdırılması və optimallaşdırılması üçün effektiv vasitələrin axtarışına son dövrlərdə müxtəlif tədqiqatlar həsr olunmuşdur və bu tədqiqatlar özünün dinamikliyinə görə fərqlənir. İstər respublikamızda, istərsə də xarici ölkələrdə aparılmış tədqiqatlarda müəllim hazırlığının psixopeqoji problemləri daha prioritetdir. Lakin tələbələrin müəllim peşəsinə hazırlığının psixopedqoji problemlərinə həsr olunmuş tədqiqatlar, ya ənənəvilik, ya da

konkret hazırlıq modelinin olmaması səbəbindən müəllim hazırlayan müəsissələrin, o cümlədən real məktəb praktikasının tələblərinə cavab vermir.

Tələbələrin müəllim peşəsinə psixopedaqoji hazırlığı uğurlu peşə fəaliyyəti üçün olduqca zəruri və əhəmiyyətli bir prosesdir. Pedaqoji fəaliyyət müəyyən mənada öz funksionallığına görə psixopedaqoji səciyyə daşıyır və şagirdlərin şəxsiyyət kimi formalaşmasında, təlim-tərbiyəsində ciddi əhəmiyyət daşıyır.

Təhsil subyektlərinin fəaliyyətinin effektiv təşkili üçün müəllim pedaqoji-psixoloji biliklərə yiyələnməli, təlimin və psixi inkişafın psixoloji mexanizmlərini aydın dərk etməli, yaşauyğun dəyişilmələri əsaslı şəkildə təhlil etməli və bu sahədə mənimsənilmiş bilikləri özünün fəaliyyətində nəzərə almağı bacarmalıdır. Müəllim peşəsini seçən hər bir tələbə peşə sahəsində öz fəaliyyətini optimal qurmaq üçün, həmçinin müəllim peşəsi haqqında vacib cəhətləri, ona verilən psixoloji tələbləri psixopedaqoji əməyin incəliklərinə yiyələnməlidir. Məhz bu səbəbdən tədqiqatçılar müəllim hazırlığında psixopedaqoji hazırlığı aparıcı istiqamət kimi qeyd edir və müəllimlərin praktik psixoloji hazırlığını pedaqoji kadrların əsas keyfiyyəti hesab edirlər.

Şübhəsiz müəllim hazırlığı müasir pedaqoji təhsildə ümüumtəhsil məktəblərinin kadr hazırlığı ilə təmin olunmasına yönəlmiş bir prosesdir.

Pedaqoji təhsil sistemində müəllim hazırlığı ilə məşğul olan müəsissələr əvvəlki ənənələri özündə ehtiva etməklə yanaşı yeni ideyaların daşıyıcısı kimi müəllimlərin pedaqoji fəaliyyətə hazırlanmasının və dünya təcrübəsində istifadənin əsas cəhətlərini özündə əks etdirməlidir. Bu bir tərəfdən təhsilin humanistləşdirilməsi və demokratikləşdirilməsi, digər tərəfdən isə yeni tipli müəllim hazırlığını həyata keçirilməsi zərurətindən yaranır.

Azərbaycan Respublikasında "Təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı fəaliyyət planında müəllim peşəsinin nüfuzunun artırılması məqsədi ilə dövlət siyasətinin inkişaf mərhələlərinin müəyyənləşdirilməsi, təhsilverənlərin peşəkarlıq səviyyəsinin daim yüksəldilməsini təmin edən yeni sistemin yaradılması, müəllim peşəsinin nüfuzunun artırılması məqsədi ilə dövlət siyasətinin inkişaf mərhələlərinin müəyyənləşdirilməsi və s. kimi məsələləri özünün strateji hədəflərində təxirəsalınmaz vəzifə kimi qarşıya qoyur.

Bu strateji istiqamət müəllim hazırlığında gələcək peşə fəaliyyətinin effektivliyinin təmin olunmasına, əlverişli təhsil mühitin formalaşdırılımasına zəmin yaradır [6].

Hetendra (2001) göstərir ki, "Azərbaycan hökuməti təhsil sisteminin keyfiyyətcə inkişaf etdirməyin və onun dövrün tələblərinə uyğunlaşdırmağın mümkün olduğunu dərk etmişdir. O, demokratik cəmiyyətin və bazar iqtisadiyyatının tələblərinə daha doğru cavab verməli, tələbələri müstəqil və problemləri həlledən düşüncə tərzinə malik olmaları üçün onları daha fəal və ineraktiv təlim imkanları ilə təmin etməlidir. 1998-ci ildə Azərbaycan hökuməti təhsil sistemini inkişaf etdirmək tələbatına cavab olaraq təhsil islahatları işləyib hazırladı. Həyata keçirilən təhsil islahatları siyasəti fənn yönümlü deyil, nəticəyönümlü təhsil sistemin yaradılmasını nəzərədə tutur [3, s.315].

Deyilənlərdən belə bir nəticəyə gəlmək olur ki, təhsilin nəticəyönümülü təmayyülərinin formalaşdırılması istiqamətində görülən işlər vasitəli şəkildə müəllim hazırlığı problemlərindən yan keçə bilməz. Nəticəyə yönəlmiş təhsil bilik, bacarıq və vərdişlərə nail olunma prosesində müəllimin rolunu yüksəldir və ona verilən digər tələblərlə yanaşı, həm də psixoloji keyfiyyətlərin inkişaf etdirilməsini nəzərdə tutur.

Məlumdur ki, təhsil sistemi bütövdür və onun bir və ya bir neçə komponentində edilmiş dəyişiklik bütünlüklə sistemi əhatə edir. Hesab edirik ki, müasir dövrdə təhsildə nəticəyönmülü sistemlə yanaşı şəxsiyyətyönümlü təhsilin paradiqmalarının yaradılması da olduqca vacibdir. Çünki onun prinsipləri müəllim hazırlığında dominantlıq kəsb edən humanistləşdirmə ideyaları ilə şərtlənir və nəticədə tələbələrdə müəllim peşəsi ilə bağlı humanist təsəvvürlər, ustanovkalar formalaşır.

İstər respublikamızda, istərsə də xarici ölkələrdə aparılmış tədqiqatlarda müəllim hazırlığının psixopeqoji problemləri daha prioritetdir. Lakin tələbələrin müəllim peşəsinə hazırlığının psixopedaqoji problemlərinə həsr olunmuş tədqiqatlar, ya ənənəvilik, ya da konkret hazırlıq modelinin olmaması səbəbindən müəllim hazırlayan müəssisələrin, o cümlədən real məktəb praktikasının tələblərinə cavab vermir. E.İ.İsayevin fikrincə, bunun əsas səbəbi "pedaqoji müəsissələrdə psixoloji hazırlıq metodlarının məqsədi, prinsipləri və metodları indiyə qədər refleksiya edilməmişdir [4].

Bu problemin həllinin müxtəlif yolları olsa da, hesab edirik ki, onun əsas həlli müəyyən təşkilatı və məzmun məsələlərinin gerçəkləşdirməsindən asılıdır.

**Ədəbiyyat**

1. Əliyev B.H., Əliyeva K.R., Cabbarov R.V. Pedaqoji psixologiya. (Dərslik). Bakı,Təhsil, 2011, 256 s.,
2. Xaliqov A. Müəllim hazırlığında müasir tələblər və kurrikulum// Azərbaycan məktəbi jurnalı, 2013, 2, s.83-86
3. Müəllim hazırlığının və orta təhsilin perspektivləri) (Qərb təhsil sisteminin təcrübəsi əsasında). Müəllimlər üçün vəsait. Bakı, adiloğlu, 2005, 474 s. s.315).
4. Исаев Е.И. Проблема проектирования психологического образования педагога // Вопр. психол. 1997. № 6.).
5. Сергев И.С. Основы педагогической деятельности. Учебное пособие. СПб.: Питер, 2004, 316 с.
6. http://www.e-qanun.az/framework/29145

**Rəyçi: prof.E.Baxşəliyev**

Göndərilib: 27.08.2020 Qəbul edilib: 29.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/98-100

**Rəna Həsən qızı İsmayılova**
Azərbaycan Dillər Universiteti
rena876@mail.ru

# AZƏRBAYCAN VƏ İNGİLİS DİLLƏRİNDƏ İNVERSİYA HADİSƏSİ VƏ ONUN SADƏ CÜMLƏ TƏRKİBİNDƏ İFADƏSİ

**Xülasə**

Məqalə müxtəlifsistemli olan azərbaycan və ingilis dillərində söz sırasına və onun cümlədə ifadəsinə həsr olunmuşdur. Hər iki dildə nəqli cümlələr sabit söz sırasına malikdir. Hər bir cümlə üzvü müəyyən mövqelərdə yerləşir və söz sırasının pozulması mənanın dəyişməsinə və ya cümlədə mənanın itməsinə gətirib çıxarır. İngilis dilində cümlədə söz sırası mübtəda, xəbər, tamamlıq, zərflik ardıcıllığı üzrə formalaşır. İngilis dilində sual cümlələrinin inversiyası geniş yayılmışdır. Belə cümlələrin xüsusi intonasiyası və kommunikativ məqsədi olur.

Məlum olur ki, sözlərin sıralanması və bu xüsusda meydana çıxan inversiya hadisəsi məsələsi həmişə dilçilərin diqqət mərkəzində olmuşdur. Söz sırası mətnin təşkilində həm qrammatik, həm də üslubi funksiya daşıyır. Başqa sözlə, söz sırası həm bilavasitə əlaqələrin yaranmasında, komponentlərin bir-biri ilə qrammatik əlaqəsinə kömək edir, həm də emosionallığa xidmət edir. Azərbaycan dilçiliyində S.Cəfərov, O.Musayev, R.Xəlilov, Ş.Yusifli, Ə.Cavadov, M.Bayramov; ingilis dilçiliyində M.Lazarkeviç, T.Koblens və başqaları bu problemlə bağlı araşdırmalar aparmışlar. Onlar belə nəticəyə gəlmişlər ki, hər bir dil hadisəsi kimi, cümlədə sözlərin sıralanması da müəyyən qanunlar əsasında baş verir. Bilirik ki, mətn cümlələr vasitəsilə reallaşır. Söhbət təkcə mətnin reallaşmasından getmir, əsas məsələ mətndəki mövzunun qavranılmasından gedir. Bununla yanaşı, mübahisəli məsələlər də mövcuddur. Bu da ondan ibarətdir ki, dildə vahid sıra sisteminin qanunauyğunluğu müəyyənləşmədiyi üçün hansı cümlənin birinci sıraya, hansı cümlənin isə çevrilmə olduğu dəqiq göstərilməmişdir, yəni araşdırma bir tərəfli aparılmışdır. Beləliklə, bir dil hadisəsi kimi sıralanmanın məzmun və mahiyyəti açılmamış, sintaktik vahidlərin sıralanmasından təcrid edilmiş şəkildə söhbət getmiş, fikrimizcə, sıra bir sistem, kateqoriya kimi nəzərdə tutulmamışdır.

Inversion phenomenon in Azerbaijani and English languages and its expression in simple sentences- mövzumun ingilis dilində adı

***Açar sözlər:*** *söz sırası, inversiya, mətn əlaqələri, sıralanma qanunları, presuppozisiya*

## Inversion phenomenon in Azerbaijani and English languages and its expression in simple sentences

**Summary**

This article deals with the word order of different languages and related to it textual connections. Narrative sentences in English have regular word order. Each member of sentence takes definite position and disruption of word order leads to the change of meaning or to the meaningless sentence itself.

Word order of the English sentence is following: subject, object, adverbial modifier. Interrogative sentences in English are formed by means of inversion. Such sentences have special intonation and communicative aim.

Linguists are always interested in the case of word order and inversion. Word order plays both grammatical and stylistic function in the text formation. In other words, word order helps both to form direct connections and grammatical and emotional connections between its components.

In Azerbaijani Linguistics S.Jafarov, O.Musayev, R.Khalilov, Sh.Yusifli, A.Javadov, M.Bayramov; in English linguistics M.Lazarkevich, T.Koblens and others investigate this problem. They came to the conclusion that word order also follows definite rules.

Text is realized by means of sentences. The basic issue is not the realization of text but realizing the main idea of the text. We also deal here with some contraversial issues. The main reason is that there is no unique rule for word order and it is unknown which position the sentence should take first in a sentence, as the research was not complete.

***Key words:*** *word order,inversion, text links, ranking laws, presupposition*

## Giriş

İnsanların bir-birinə ötürdüyü fikrin maddi varlıq şəkli olan cümlə dinləyiciyə çatmaq üçün müxtəlif mərhələlərdən keçir. Dilin səslərdən başlayaraq cümləyə doğru inkişafında səslərlə səslərin, köklə şəkilçinin, şəkilçi ilə şəkilçinin, sözlərlə sözlərin, cümlələrlə cümlələrin birləşməsində müəyyən ardıcıllıq, sıralanma

özünü göstərir. Dil vahidləri müəyyən qanunlar və qanunauyğunluqlar əsasında düzüldükdən, sıralandlıqdan sonra insanlar arasında kommunikasiya imkanları formalaşır.

Dil vahidlərinin sıralanmasının spesifik qanunları və bunun aparıcı mövqedə olması haqqında geniş fikirlər mövcuddur. Məsələn, V.Yartseva (1948:406) qeyd edir ki, sıralanma qanunları heç bir qrammatik qayda-qanunla məhdudlaşmır. Söyləmlərin yaranmasında əsassız rola malik olan sintaktik əlaqə vasitələrinin sözlərin cümlədə düzülüşündə heç bir rolu yoxdur. Müəllif onu da bildirir ki, dil vahidlərinin sıralanmasının spesifik qanunları, bu qanunun nəticəsi kimi inversiya tipoloji istiqamətdə hələ də müəyyən olunmamışdır. Bunlar gələcək tədqiqatlarda mütləq nəzərə alınmalıdır.

Söz sıralanmasının bir vəzifəsi də mətni əlaqələndirən sintaktik vasitələrdən biri olmasıdır. Söz sırası sintaktik, üslubi və semantik əhəmiyyətinə görə cümlə üzvlərinin qarşılıqlı şəkildə yerləşdirilməsi, sıralanmasıdır. Söz sırasının sintaktik rolu ondan ibarətdir ki, cümlə üzvünün yerindən asılı olaraq onun qrammatik vəzifəsi də dəyişmiş olur.

Aparılan araşdırmalar sübut edir ki, mətnin dərk edilməsi dilçilikdə bir terminlə "presuppozisiya" ilə bağlıdır. F.Kufer (1978: 337-353) yazır ki, presuppozisiya söz birləşməsi tərkibində tabe sözün tabedici sözdən əvvəl, habelə köməkçi sözlərin bağlı olduqları müstəqil sözlərdən əvvəl yerləşdirilir.

Azərbaycan dilinin izahlı dilçilik terminləri lüğətində də yuxarıdakı izah özünə yer etmişdir. (Adilov M., Verdiyeva Z., Ağayeva F., 1989: 220)

Hər bir söyləm sırasının presupozisiyası vardır. Bu və ya başqa predmet və ya hadisə barəsində hər hansı hökm ifadə olunduqda danışan bilərəkdən və ya kortəbii şəkildə, anlayaraq və ya anlamadan həmin əşya və ya hərəkət haqqında var olan biliyini nümayiş etdirir.

Azərbaycan dilinin iltisaqi dillərə məxsus olduğunu nəzərə alsaq deyə bilərik ki, eyni kökdən həm isim, həm sifət, həm zərf, həm də feil yaradıla bilir. Bu da cümlə strukturunda eyniköklü üzvlərin ardıcıl sıralanmasına, başqa sözlə, ahəngdarlığına imkan yaradır.

Söz sırası canlı danışıq dilinin təsiri ilə üslubi cəhətdən pozula bilir.

İngilis dilində nəqli cümlələr sabit söz sırasına malikdir. Hər bir cümlə üzvü müəyyən mövqelərdə yerləşir və söz sırasının pozulması mənanın dəyişməsinə, və ya cümlədə mənanın itməsinə gətirib çıxarır. İngilis dilində cümlədə söz sırası mübtəda, xəbər, tamamlıq, zərflik düzülüşü üzrə formalaşır.

Bu dildə istifadə olunan cümlələrdə təyinin yeri sabit deyil. Təyin cümlədə təzahür olunan hər hansı bir cümlə üzvünün qarşısında işlənə bilir. Məs.: *I gave him my favourite pet (Mən ona sevimli ev heyvanımı verdim).*

Cümlələrdəki söz sırasını müşahidə və müqayisə etsək, görərik ki, (1) mübtəda, 2 (xəbər), 3 (təyin), 4 (tamamlıq), 5 (zaman zərfliyi) sırası reallaşır. Bu sıra ingilis dilinə xasdır. Azərbaycan dili üçün isə 1 (mübtəda), 2 (zaman zərfliyi), 3 (təyin), 4 (tamamlıq), 5 (xəbər) sırası başlıca formal əlamətdir.

Tədqiqatların nəticəsi göstərir ki, müqayisə edilən dillərdə söz sırası iki əsas funksiyanı yerinə yetirir:

1) semantik-sintaktik funksiya;

2) üslubi funksiya ( Xəlilov R., 1970: 5,30)

Xüsusilə də türk dillərindən bəhs olunan tədqiqatlarda inversiyanın üslubi rolu əsaslandırılmışdır. Üslubi məsələ aktual üzvlənmə ilə bağlı fikirlərin yaranmasında, bədii üslubda ekspressivliyin, emosionallığın yaranmasında bu hadisənin rolu, məntiqi vurğunun intensivliyi, əks sıra və sintaktik konstruksiyaların yaranması və s. bu istiqamətdə tədqiqatların obyekti ola bilmişdir. (Budaqova Z.İ., 1963: 111)

Semantik-sintaktik funksiya adı altında tutulan dillərdə söz sırası mübtəda və vasitəli tamamlığın yerinin dəyişməsi ilə səciyyələnir və cümlənin ümumi semantikası və sözün sintaktik funksiyasında dəyişiklik baş verir. Məsələn:

İngilis dilində: *Paul saw Kate. Kate saw Paul.*

Azərbaycan dilində: *Çoban canavar öldürdü. Canavar çoban öldürdü.*

Söz sırasının üslubi funksiyası adı altında isə cümlənin ümumi semantikasında müxtəlif variantlar müxtəlif məna çalarları meydana gətirir. Məsələn.:

İngilis dilində: 1. *We shall arrive tomorrow. Tomorrow We shall arrive.* 2. *She did not buy a book. Not a book did she buy.*

Azərbaycan dilində: 1. *Mən sabah şəhərə qayıdacağam. Şəhərə mən sabah qayıdacağam.* 2. *O, ilk görüşə getmədi. İlk görüşə o getmədi.*

Buradan da aydın olduğu kimi, söz sırası Azərbaycan dilində üslubi funksiyanı yerinə yetirir, ingilis dilində isə semantik-sintaktik funksiya icra edir. Bu hər bir dilin morfoloji strukturundan irəli gəlir. Məlum olduğu kimi, ingilis dili zəngin flektiv formalarını tarixi inkişaf prosesində itirib, söz sırasının böyük əksəriyyəti obyektiv-subyektiv münasibətlərin ifadəsinə çevrilib. Azərbaycan dilində isə zəngin morfoloji

vasitələr, cümlə üzvləri arasında sintaktik əlaqələr əsas etibarı ilə formal göstəricilərlə öz ifadəsini tapır, ona görə də bütün söz sırası bu dildə mühüm üslubi vasitə kimi çıxış edir və böyük məna imkanları yaradır.

"İnversiya" termini (lat.inversio) çevrilmə, sıranın dəyişməsi anlamında istifadə olunur. Cümlədəki adi söz sırasının pozulması mənasında işlənir. Cümlədəki fikir, məna və üslubi məqsəd dəyişə bilir.

İngilis dilində inversiyanın bir sıra səciyyəvi xüsusiyyətləri var: 1) "İnversiya" yalnız baş üzvlərin, yaxud cümlənin ümumi üzvlərinin yerlərini dəyişməsi deməkdir; 2) inversiyaya ingilis dilinin sual cümlələrində daha çox rast gəlinir;

İngilis dilində sual cümlələrinin xüsusi intonasiyası və kommunikativ məqsədi olur. Həmsöhbətlər məqsəddən asılı olaraq sual məqamlarını, bir-birinə münasibətlərini dəyişə bilirlər. Məsələn: *Do you like music? Did he go yesterday?*

Bu cümlələrin sual forması *to do* köməkçi feili vasitəsilə əmələ gəlir. Həm də inversiyanın sual cümləsində yaranmasına şərait yaradır.

İngilis dilinin nəqli cümlələrində də inversiya çox müşahidə olunur. Bu sıra Azərbaycan dilində olduğu kimi, "mübtəda +xəbər" sırasına əsaslanır. Məs.: *On the counter next the cheese, sat a quiet looking cat.*

## Nəticə

Deyilənləri ümumiləşdirsək belə qənaətə gələrik ki, sıra hər iki dildə kateqoriya təşkil edən məsələdir və ümumi dil hadisələrindən hesab edilir.

İngilis və Azərbaycan dilləri Tipoloji baxımdan fərqli olsalar da bənzər sıralanmaya rast gəlmək olur.

Hər iki müqayisə edilən dilin quruluşunda sıralanmanın özünəməxsus yeri vardır. Lakin sıralanmanın birində üslubi məqam üstünlük təşkil edirsə, digərində sintaktik-semantik prinsip aparıcı mövqedədir. Bu da inversiya hadisəsinin iki dildə olan başlıca fərqli cəhət olduğunu sübut edir.

Beləliklə, Azərbaycan dilinə məxsus mətnlərin quruluşu ingilis dilindəki mətnlərdən ciddi şəkildə fərqlənir. Fərqlər ən çox cümlə səviyyəsində müşahidə olunur ki, bu da daha çox söz sırası ilə bağlı fərqlərdir.

## Ədəbiyyat

1. Ярцева.В.Н. Свободное и связанное дополнение в английском языке. Язык и мышление, 1948.
2. Кифер. Ф. О Пресуппозиция Новое в зарубежной лингвистике, 1978.
3. Adilov M., Verdiyeva Z., Ağayeva F. İzahlı dilçilik terminləri. Bakı, Maarif, 1989
4. Xəlilov R. "Söz sırası", Azərbaycan bədii dilinin üslubiyyatı, Bakı, 1970, s 300
5. Budaqova Z.İ. Müasir Azərbaycan ədəbi dilində sadə cümlə. Bakı, 1963
6. Əliyeva X. Improve your English through speaking, Bakı, 2018, s 16
7. Kazımov Q. Müasir Azərbaycan dili. "Təhsil", Bakı, 2007, s 163
8. Halperin I.R. Text as an object of linguistic research. M:Science, 2015
9. Kudasova O.K. "The role of stylistic reception in the organization of scientific evaluation text", 2014
10. M.A.K. Halliday."Notes on transitivity and the theme in the English language", 2013

**Rəyci: f.f.d.X.Əliyeva**

Göndərilib: 07.08.2020 Qəbul edilib: 09.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/101-104

**Ələkbər Göyüş oğlu Əlverdiyev**
Bakı, Azərbaycan
aliakbar.alverdiyev@gmail.com

# DAYANIQLI MÜSTƏQİL AUDİT XİDMƏTİNİN TƏKMİLLƏŞDİRİLMƏSİ YOLLARI

**Xülasə**

Bir ölkənin inkişafı və sosial-iqtisadi böyüməsi bu ölkədə yaşayan insanların qurduğu müəssisələrin uğurundan asılıdır. İqtisadi təşkilatların uğuru mühasibat uçotunun hüquqi infrastrukturundan və tətbiq ediləcək mühasibat və audit metodlarından asılıdır. Bir ölkənin mühasibat və təftiş mexanizmi yoxdursa, o ölkənin sağlam audit xidməti sisteminə və texniki imkanlara sahib olduğunu qeyd edə bilmərik. Mühasibat sistemi, təşkilatların iqtisadi fəaliyyətlərinin ədədi qeydlərini ümumi qəbul edilən mühasibat əsaslarına uyğun olaraq və ardıcıl qaydada tənzimləməyə borcludur. Digər tərəfdən, audit xidməti, iqtisadi hadisələrin həqiqi təbiətinin qeydlərə müvafiq qanunvericiliyə və mühasibat əsaslarına uyğun olub-olmadığını obyektiv şəkildə araşdıran, bağlayan və təsdiqləyən sistematik bir işdir. Buna görə də, ölkələrin inkişafına mane olan vergidən yayınmanın qarşısını almaq və qeyri-rəsmi iqtisadiyyatı qeydiyyata almaq çox vacibdir. Bu yalnız yaxşı işləyən audit xidməti və effektiv nəzarət ilə baş verə bilər. Auditin səmərəliliyi birbaşa olaraq Auditorlar Palatası tərəfindən təmin edilə bilər.

***Açar sözlər:*** *audit xidməti, effektiv nəzarət, mühasibat sistemi, qanunvericilik, balanslaşdırılmış nəzarət, audit konsepsiyası, maliyyə əməliyyatları*

## Ways to improve sustainable independent audit services

**Summary**

The development and socio-economic growth of a country depends on the success of the enterprises established by the people living in that country. The success of economic organizations depends on the legal infrastructure of accounting and the accounting and auditing methods to be applied. If a country does not have an accounting and auditing mechanism, we cannot say that it has a sound audit service system and technical capabilities. The accounting system is obliged to regulate the numerical records of economic activities of organizations in accordance with the generally accepted principles of accounting and in a consistent manner. On the other hand, the audit service is a systematic work that objectively examines, concludes and confirms whether the true nature of economic events is in accordance with the relevant legislation and accounting principles. Therefore, it is very important to prevent tax evasion, which hinders the development of countries, and to register the informal economy. This can only happen with a well-functioning audit service and effective control. The effectiveness of the audit can be ensured directly by the Chamber of Auditors.

***Key words:*** *audit service, effective control, accounting system, legislation, balanced control, audit concept, financial operations*

## Giriş

Bu gün təkmilləşdirilmiş mühasibat və audit xidməti olmadan iqtisadi cəhətdən inkişaf etmiş heç bir ölkə bazar iqtisadiyyatı şəraitində ciddi nailliyətlər əldə edə bilməz. Yalnız milli deyil, beynəlxalq maliyyə nəticələri də sosial-iqtisadi həqiqətləri özündə göstərməlidir. Maliyyə sferasındakı iqtisadi yüksəliş yalnız müstəqil audit yolu ilə əldə edilə bilər. Bu məqalənin məqsədi auditin zəruriliyini, eyni zamanda audit daxilində balanslaşdırılmış mütləq nəzarəti vurğulamaqdır. Bu məqsədlə, əvvəlcə mühasibat və audit konsepsiyası və audit ilə mühasibat arasındakı əlaqə araşdırılacaq, sonra müstəqil auditin quruluşu və son nəticədə bunun əhəmiyyəti açıqlanacaq.

Cəmiyyətin sosial-iqtisadi ehtiyaclarının artmasına və bu ehtiyacların şaxələnməsinə paralel olaraq dünya üzrə müəssisələr genişləndi və yeni iş növləri meydana çıxdı. Sahibləri və ya ortaqları bir nəfər olduqda və fəaliyyətləri məhdud olduqda, müəssisələrin idarə olunması normalda çox asandır. Bununla birlikdə, insanların və cəmiyyətin ehtiyaclarına uyğun olaraq, iqtisadi böyüdükdə, müxtəlif sektorlarda genişləndikdə və şaxələndikdə müəssisələri nəzarət altında saxlamaq çətinləşir. Beləliklə, maliyyə əməliyyatlarının qeyd edilməsinə ciddi ehtiyac yaranmaqla audit xidməti əhəmiyyət qazanmışdır. Bu vasitə ilə 18-ci əsrdən kütləvi şəkildə maliyyə əməliyyatları qeydə alınmış və bu əsasda təkmilləşdirilməyə doğru istiqamət almışdır[2].

Mühasibat uçotunun dolayı yolla mənbəyi olan auditin vəzifəsi yalnız müəssisə rəhbərlərini məlumatlandırmaq deyil. Bu menecerlərlə yanaşı, bu iş ilə maraqlanan bir çox insana və qrupa aiddir. Bu

fərdlər və qruplar ticarət dünyasında geniş yayılmışdır. Ehtiyac olduqda, müəssisələrdən məlumat tələb edirlər. Bazarda şirkətin səhmlərini alan irili-xırdalı investorlar və həmin şirkətlə iş aparan iş sahibləri buna nümunə göstərilə bilər.

Aydındır ki, cəmiyyətin inkişafı və mürəkkəbliyi etibarlı məlumata ehtiyacını daha da artırır. Xüsusilə sahibkarlar baxımından, müəssisələrə qoyduqları və ya etməyi planlaşdırdıqları investisiyalardakı əsas meyarın əldə etdikləri məlumatların etibarlılığından başqa bir şey olmadığı mübahisəsiz bir həqiqətdir. Açıqlanan məlumatların kifayət qədər etibarlı olmaması qərar qəbul edənləri bu mövzuda bəzi tədbirləri görməyə məcbur edir.

**Müstəqil audit xidmətinin əsasları və inkişafında mövcud problemlər**

Audit xidməti bildiyimiz kimi, kommersiya fəaliyyətinin inkişafı ilə özünəməxsus iqtisad önəm kəsb etməyə başladı. Ticarət fəaliyyəti və maliyyə prosesləri baş verdiyi yerdə mütləq bir audit xidməti olmalıdır. Auditi geniş şəkildə təhrif etmək mümkündür:

- mühasibat məlumatlarını - iqtisadi fəaliyyət və hadisələrin cari nəticələrini - başqa sözlə, müəyyənləşdirmək,

- tamlıq, həqiqət, dəqiqlik, qanunilik, aydınlıq və qərəzsizlik adlanan audit prinsiplərinə uyğun olaraq ümumi qəbul edilmiş audit standartları çərçivəsində sübutlara əsaslanaraq gələcəkdə sosial-iqtisadi çatışmazlıqların qarşısını almağa kömək etmək üçün aparılan yoxlamaya xas olan meyarlar və standartlar hazırlayaraq, maliyyə rəhbərliyi - sahibkarlara müəssisəyə investisiya qoyuluşlarının gələcəyi barədə məlumat verərək - maliyyə nəzarəti sistemlərinə rəhbərlik, başqa sözlə, mühasibat yoxlamalarının etibarlı və ardıcıl olmasına yönələn nəzarət metodlarından istifadə edərək müxtəlif sapmaları müəyyən etmək,

- iqtisadi nəticələrdən istifadə edərək obyektiv mühakimə və ya nəticə çıxarmaq və sonda onları müxtəlif sahibkar təbəqəsinin iştirak etdiyi qruplara çatdırmaq üçün istifadə olunan sistemli bir proses kimi ifadə edilə bilər[4].

Necə ifadə olunmasından asılı olmayaraq, auditin ifadə olunmasının təməlində fiziki və hüquqi şəxslər tərəfindən iqtisadi mənbələrdən istifadəni hesablayan hesabatlılıq anlayışıdır. Hesabatlılıq idarəetmə və maliyyə hesabatı olaraq ayrı-ayrılıqda araşdırılmalıdır. Bu, auditin dinamik bir fəaliyyət olduğunu göstərir. İlkin iqtisadi biliklərin yaradılması və qərar vermə mərhələləri də daxil olmaqla rasional, planlı və elmi səylərdən ibarətdir.

Audit, iqtisadi fəaliyyət və hadisələrlə əlaqədardır. Mühasibat uçotu iqtisadi məlumatların müəyyənləşdirilməsi, ölçülməsi və hesabatı funksiyalarına malikdir. Yoxlama əvvəlcədən müəyyən edilmiş ümumi prinsiplərə (meyarlara) əsaslanır[1]. Auditor nəticələrini və nəticələrini müvafiq tərəflərə çatdırmaq üçün ümumi bir ünsiyyət dilindən istifadə edir. Bu dil əvvəlcədən təyin olunmuş hədəflərə, standartlara və meyarlara əsaslanır. Nəzarət isə çox vaxt neytraldır. Auditor qərəz vermədən müstəqil şəkildə araşdırır və əldə edilmiş nəticələri diqqətlə və qərəzsiz toplanan dəlillər əsasında əlaqədar tərəflərə təqdim edir. Nəticələrin hesabatı (hesabat) auditin son mərhələsidir. Auditor imtahanla bağlı yazılı hesabatda tapıntılarını, fikirlərini və qərarlarını izah edir. Audit həmişə iqtisadi proseslərdə proqnoz vermə imkanına malikdir. Yoxlamadan keçmiş hadisələr, iqtisadi əməliyyatlar və fəaliyyətlər bir daha nəzərdən keçirilərək nəticəyə gəlinsə də, əsas məqsəd keçmiş itkilərin aradan qaldırılması əvəzinə gələcək zərərlərin qarşısını almaq üçün ətraf mühitə xas tədbirlərin müəyyənləşdirilməsidir. Başqa sözlə, audit xidməti gələcəkdə bir sığorta funksiyasını həyata keçirir.

Yuxarıda göstərilən tərifə daxil edilmiş və müəyyən fikrin formalaşması üçün kifayət qədər, uyğun və keyfiyyətli iqtisadi sübut toplamaq üçün düzgünlüyə, marketinq şəraitində həqiqi var olub-olmamasına və qanunvericiliyə uyğunluğu araşdırmağa yönəlmiş audit prosedurları ilə bağlı beş yoxlama prinsipi mövcuddur;

1. Bütün əməliyyatlar və hadisələrin tamamlanması, qeyd edilməsi;
2. Gerçəklik (baş vermə), qeydə alınan prosesin və hadisələrin müvafiq dövr ərzində faktiki baş verməsi;
3. Dəqiqlik (doğruluq), qeydə alınmış əməliyyatlar dəqiq hesablanmış, qiymətləndirilmiş və ölçülmüşdür;
4. Mütəmadi olaraq qanuni qaydaların pozulmaması və
5. Yuxarıda qeyd olunan əməliyyatların açıq şəkildə təsnif edildiyi və aid olduqları hesaba daxil edildiyi deməkdir[3].

### Müstəqil audit xidmətinin vacibliyi və dayanıqlığının təmin olunması yolları

Cəmiyyəti təşkil edən insanlar və təşkilatlar, müəssisələr haqqında qərar qəbul etmək üçün etibarlı məlumatlara ehtiyac duyurlar. Müəssisələrdən alınan məlumatların etibarlı olmama riskləri də mövcudur. Bunun əsas səbəbləri:

1-Mühasibat məlumatlarının çoxluğu və mürəkkəbliyi;
2-Müvafiqlərin əksəriyyəti işdən uzaqdır və ya
3-Məlumat verənlərin qeyri-stabilliyi.

İnformasiya riskini təşkil edən şərtlər müstəqil auditor tərəfindən aparılan yoxlamanın səbəbləri kimi qəbul edilə bilər. Bu şərtlər:

1-Maraqlar toqquşması;
2-Mühasibat sisteminin mürəkkəbliyi;
3-Məlumatların alınacaq qərarlarla əlaqəliliyi və ya
4-Digər səbəblər[6].

Müstəqil auditi şərtləndirən əsas amillər isə bunlardır;

1- Daha yaxşısını və faydasını axtarma meyli;
2-Tətbiq dəyişiklikləri (şərh fərqi);
3-Tətbiq qüsurları;
4-Tətbiq prosesində sosial yanlışlıqlar və iqtisadi tarazlığın pozulması;
5-Mövcud qaydalar tətbiqetmə ilə uyğun gəlməməsi;
6-Prosesdə zəif iqtisadi axarlılıq
7-Təşkilatda korrupsiyanın qarşısının alınması[7].

Müstəqil audit, ümumi qəbul edilmiş audit standartlarına uyğun olaraq peşəkar prinsiplər (bəzən ümumi prinsiplər də adlanır), iş prinsipləri və hesabat prinsipləri kimi beynəlxalq normalara uyğun olaraq aparılır. Mühasibat uçotu işinin əsası, yoxlanılan müəssisənin maliyyə hesabatları barədə rəy almaqdır. Qeydlərə və buna görə də maliyyə hesabatlarına əsaslanaraq onlara etibar etməliyik. Ticarətlə maraqlanan qruplar, bu maliyyə hesabatlarına güvənərək müəssisə ilə bağlı qərarlar qəbul edir və qəbul etdikləri qərarları həyata keçirirlər.

Müəssisədə dayanıqlılığın təmin olunmasında müstəqil auditin iş üçün faydaları üç ümumi şəkildə təsnif edilə bilər. Bunlar;

1-Rəhbərlərin tabeliyində olan şəxslərin fəaliyyətlərini daha yaxşı qiymətləndirmək və təşkilatdaxili planlar və gözləntilər haqqında məlumat əldə etmək imkanını təmin edən ünsiyyət;

2- Daxili və xarici iqtisadi müqayisələrin köməyi ilə yuxarı orqanlar tərəfindən müəssisələr tərəfindən tətbiq olunan qiymətləndirmə,

3-Tabelikdə olan işçiləri müəssisənin ümumi planı daxilində işlərini ən səmərəli şəkildə həyata keçirməyə təşviq etmək kimi ifadə olunan sosial-iqtisadi motivasiya[8].

Müstəqil audit nəticəsində çıxarılan hesabatlar müəssisənin müsbət və mənfi maliyyə vəziyyətini tərəfsiz və obyektiv şəkildə müəssisə rəhbərliyinə təqdim edir. Müstəqil auditor tərəfindən təsdiqlənmiş maliyyə hesabatı etibarlı, dəqiq və şəffaf maliyyə hesabatıdır. Bu, iş menecerinə daha sağlam və daha dəqiq qərar vermək imkanı verir.

Müstəqil audit tamamilə qərəzsiz şəxslər tərəfindən aparıldığından və obyektiv şəkildə bildirildiyindən, bütün tərəfdaşların və xüsusən də idarəetməyə cəlb olunmayan tərəfdaşların hüquqları müstəqil yoxlanılan bir işdə daha yaxşı qorunur. Şirkət daxilində və xaricində hər cür natamam, səhv və haqsız tətbiqlər açıq şəkildə ortaya qoyulur. Müstəqil audit şirkət rəhbərliyinin bəzi hadisələri və bəzi faktları bilərəkdən və ya bilməyərəkdən ört-basdır etməsinə imkan verməməsi baxımından çox vacib bir funksiyaya malikdir.

Maliyyə hesabatlarının müstəqil bir auditor tərəfindən yoxlanılması həm alqı-satqı münasibətləri qurduqları müəssisələr, həm də iqtisadi əməkdaşlıq quracaqları pul və kapital bazarı qurumları baxımından edilən qiymətləndirmələrdə xeyli sayda fayda verir. Müstəqil bir yoxlamadan keçmiş və maliyyə hesabatları sayəsində təsdiqlənmiş müəssisə, audit hesabatında göstərilən şərtlər və qeydlər çərçivəsində etibarlı və üstünlük verilən ciddi bir iqtisadi işdir.

### Nəticə

Bir iqtisadi təşkilat (müəssisə) qurmaq və fəaliyyəti davam etdirmək üçün effektivliyin qarşısını alan müxtəlif problemləri aradan qaldırmaq lazımdır. Təşkilatın gələcək, qısa və uzunmüddətli planlarını hazırlamaq, planın tətbiqini araşdırmaq üçün şübhəsiz ki, müstəqil audit xidməti təşkilatın problemləri ilə

bağlı bir çox məlumat verir. Bununla birlikdə, təşkilatın problemlərini araşdırma yolu ilə ortaya qoymaq, bəzi proseslərin diqqətdən kənarda qalmasına və yaşanan problemlərin gizli davam etdirilməsinə səbəb olur[5]. Bu nöqtədə etibarlı məlumatlara əsaslanan müstəqil audit yuxarıda göstərilən xüsusiyyətlərdəki problemləri aradan qaldırmaq üçün bir həll yolu olaraq ortaya çıxır. Bu həlləri konkret olaraq bu cür təsnifləşdirə bilərik:

1.Qərar qəbul edən şəxs açıqlanan veriləcək qərar üçün məlumatların kifayət qədər etibarlı olmasına çalışmalıdır.

2.Daha etibarlı məlumat əldə etməyin yaratdığı fayda bu məlumatı əldə etmək xərcini üstələdiyi müddətdə qərar qəbul edən ümumi qəbul edilmiş audit standartları çərçivəsində müəssisəyə spesifik bir yol xəritəsi tətbiq etməlidir.

3.Bu yol xəritəsi müstəqi audit xidmətinin nəzarəti altında müəssisədaxili yalnız bir rəhbər şəxs tərəfindən tətbiq olunmalı və açıqlanan məlumatların etibarlı olub-olmadığını araşdırmaq üçün istifadə olunan ümumi vaxt proseduru minimuma endirilməlidir.

4.Dəqiqliyi və tərəfsizliyi yoxlanılmış və təsdiqlənmiş məlumatlar sahibkarlığa dəstək fonunda artıq hökümət rəsmiləri tərəfindən də etibarlı məlumat kimi qəbul edilir.

**Ədəbiyyat**

1. Abbott, L.J., Parker, S., Peters, G.F., Raghunandan, K., 2003b. The association between audit committee characteristics and audit fees. Auditing: A Journal of Practice and Theory 22(2), 17-32.
2. Balvers, R.J., McDonald, B., Miller, R.E., 1988. Underpricing of new issues and choice of auditor as a signal of investment banker reputation. The Accounting Review 63(4), 605-622. 3. Beyer, A., Sridhar, S.S., 2006. Effects of multiple clients on the reliability of audit reports. Journal of Accounting Research 44(1), 29-51.
4. Blacconiere, W., DeFond, M., 1997. An Investigation of Audit Opinions and Subsequent Auditor Litigation of Publicly-Traded Failed Savings and Loans. Journal of Accounting and Public Policy (16), 415-454.
5. Chan, L.H., Chen, K.C.W., Chen, T.Y., Yu, Y., 2012. The effects of firm-initiated clawback provisions on earnings quality and auditor behavior. Journal of Accounting and Economics 54, 180-196.
6. Patterson, E., Wright, D., 2003. Evidence of fraud, audit risk and audit liability regimes. Review of Accounting Studies 8(1), 105-131.
7. Scholz, S. 2011. The changing nature and consequences of public company financial restatements 1997–2006. Department of the Treasury, 2008.
8. Walker, P. L. Casterella, J. R., 2017. The role of auditee profitability in pricing new audit engagements. Auditing: A Journal of Practice & Theory 19(1), 157-167.

**Rəyci: dos. D.Məmmədova**

Göndərilib: 07.08.2020 Qəbul edilib: 09.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/105-108

**Elçin Fərhad oğlu Osmanov**
Bakı, Azərbaycan
osman.elchin@gmail.com

# AZƏRBAYCANDA ƏLVERİŞLİ BİZNES MÜHİTİNİN TƏMİN OLUNMASI VƏ BİZNESİN İDARƏ OLUNMASININ KONSEPTUAL ƏSASLARI

**Xülasə**

Azərbaycan dövlətinin ən mühüm məqsədlərindən biri Avropa strukturlarına inteqrasiya etməkdən ibarətdir. Buradan da əlverişli igüzar mühitin həyati vacib kəsb etməsi meydana çıxır. Bu gün Azərbaycanın əsas vəzifələrindən biri investisiyaların diqqətini qeyri-neft sektorunun inkişafına yönəltməkdən, eləcə də kiçik və orta sahibkarlarla transmilli korporasiyalar arasında franşiz və kooperasiya əlaqələrini inkişaf etdirməkdən ibarətdir. Ötən illərdə biznes və investisiya mühitinin davamlı olaraq yaxşılaşdırılması, bu sahədə qanunvericilik bazasının tekmilləşdirilməsi, inzibati prosedurların sadələşdirilməsi, səmərəli fəaliyyət göstərən dövlət dəstəyi, o cümlədən vergi güzəştlərinin tətbiqi, subsidiyaların verilməsi, aqrolizinq xidmətlərinin şebekəsinin genişləndirilməsi öz bəhrəsini verib. Məqalədə Azərbaycanda biznes mühitinin təşkil olunmasının konseptual əsasları və Biznes mühitinin yaradılması ilə bağlı dövlətin apardığı prioritet istiqamətlər göstərilmişdir.

***Açar sözlər:*** *sahibkarlıq, inkişaf, innovasiya, biznes mühiti, idarəetmə, infrastruktur*

## Conceptual Framework for Ensuring a Better Business Environment and Business Management in Azerbaijan

**Summary**

One of the most important goals of Azerbaijan is to integrate into European structures. It also emerges that a favorable climate environment is vital. One of the main objectives of Azerbaijan today is to direct investment to the development of the non-oil sector, as well as to develop franchise and cooperative relationships between SMEs and transnational corporations. Over the past years, the business and investment climate has been steadily improving, improving the legislative framework in this area, simplifying administrative procedures, effective government support, including tax benefits, subsidies, and expanding agro-financing. The article outlines the conceptual framework for the establishment of the business environment in Azerbaijan and the government's priorities for establishing the business environment.

***Key words:*** *entrepreneurship, development, innovation, business environment, management, infrastructure*

## Giriş

«Biznes» sözü dünyanın bütün ölkələrində istifadə olunur. Gəlir gətirən fəaliyyət və bu fəaliyyətlə məşğul olan insanlar müxtəlif ölkələrdə müxtəlif cür adlandırılır. İstənilən biznesin müəssisə şəklində öz iqtisadi-təşkilati forması olur. Müəssisə oxşar mühitdən bazarda ayrılmağa cəhd edərək firma adı və atributları şəklində öz fərqli cəhətlərini yaradır. Burada biznes anlayışı genişdir: biznesə təkcə fəaliyyət prosesi kimi deyil, həm də mülkiyyət obyekti kimi baxılır, hansı ki, satmaq, girov qoymaq, sığortalamaq, vəsiyyət etmək olar. Bu halda biznes saziş, əmtəə obyektinə çevrilir.

Biznes anlayışı genişdir: biznesə təkcə fəaliyyət prosesi kimi deyil, həm də mülkiyyət obyekti kimi baxılır, hansı ki, satmaq, girov qoymaq, sığortalamaq, vəsiyyət etmək olar. Biznes ticarət-istehsal-ticarət sxemi üzrə əmtəənin son istehlakçıya çatdırılması ilə əlaqədar həyata keçirilən fəaliyyətdir. Deməli, biznes təkcə kommersiya fəaliyyəti deyil, həm də istehsal sferasında həyata keçirilən fəaliyyət növüdür.

Azərbaycanın milli iqtisadiyyatının bazar prinsipləri əsasında formalaşması həlli vacib olan problemlər sırasında biznesin inkişaf etdirilməsini ön plana çəkir. Bu isə aşağıdakılarla şərtlənir: birincisi, inkişaf etmiş ölkələrin təcrübəsindən aydın olduğu kimi, müasir biznes, sahibkarlıq rəqabət şəraitində bazar subyektlərinin istehsal təsərrüfat fəaliyyətinə xas olan əlamətdir; ikincisi, ölkə İqtisadiyyatının qarşısında duran vəzifələrin mürəkkəbliyi, regionlann sosial-iqtisadi inkişatının sürətləndirilməsi; üçüncüsü, praktiki olaraq istehsalın bütün elementlərinin təkmilləşdirilməsinin, yeni təsərrüfat davranış stilinin mənimsənilməsinin zəruriliyi.

Biznes - istehlakçıların tələbatının ödənilməsi və mənfəətin (gəlirin) əldə edilməsi məqsədilə təşəbbüskar insanlar arasında işgüzar münasibətlərin məcmusudur. Biznes və onun mühüm istiqaməti olan sahibkarlıq fəaliyyəti bazar iqtisadiyyatının ayrılmaz tərkib hissəsidir, iqtisadi artım tempini, ümumi daxili məhsulun strukturunu və keyfiyyətini müəyyən edir. Biznesin inkişafı demokratik prinsiplərə və azad bazar münasibətlərinə əsaslanan milli iqtisadiyyatın formalaşması və davamlı inkişafına kömək edir. Belə ki,

müasir biznesin sürətli inkişafı sayəsində Azərbaycan iqtisadiyyatında qeyri-dövlət sektoru aparıcı mövqeyə çıxmış, yəni ümumi daxili məhsulda onun payı 81 faizə çatmışdır Biznesin məqsədi — müəssisənin uzun müddət öz fəaliyyətində cəhd etdiyi son nəticədir. Biznesin məqsədi onun xarakterindən, inkişaf səviyyəsindən asılı olaraq müxtəlif ola bilər .

## Əsas hissə

Azərbaycanın iqtisadi strategiyasının prioritet istiqamətlərindən biri sahibkarlığın inkişafı, əlverişli biznes mühitinin təmin olunmasıdır. Odur ki, Azərbaycanda sahibkarlığın inkişafına xüsusi diqqət göstərilir, sistemli və kompleks tədbirlər həyata keçirilir. Dünyanın qabaqcıl dövlətlərinin əsas inkişaf tendensiyalarına müvafiq olaraq ölkədə iqtisadiyyatın informasiyaya, biliyə, İKT-yə, texnologiyaya, innovasiyaya əsaslanaraq inkişaf etdirilməsinin zəruriliyi müxtəlif aspektlərdə elmi cəhətdən əsaslandırılmışdır.

Ölkəmizdə elan olunanyeni iqtisadi siyasətin da prioritetlərindən biri biznes mühitinin inkişafı, iqtisadiyyata sərmayə qoyuluşunun stimullaşdırılmasıdır. Çünki məhz bu qeyri-neft sektorunun inkişafında, iqtisadiyyatın ixrac imkanlarının artırılmasında xüsusilə mühüm əhəmiyyət kəsb edən faktordur. Odur ki, ilin əvvəlindən həyata keçirilən islahatlarda biznes mühitinin inkişafı ilə bağlı məqamlar da öz əksini tapıb. Belə ki, sahibkarlıq sahəsində aparılan yoxlamalar dayandırılıb, lisenziyalaşdırma sistemi təkmilləşdirilib, investisiyaların təşviqi və qeyri-neft məhsullarının ixracının stimuilaşdırılması sahəsində mühüm qərarlar qəbbul edilib. Atılmış addımlar özəl bölmənin inkişafında mühüm əhəmiyyət kəsb etməklə yanaşı, biznes və investisiya mühitinin yaxşılaşdırılması baxımından da mühüm əhəmiyyət daşıyır.

İqtisadiyyatın inkişafının innovasiya mərhələsinin əsas hədəfi milli iqtisadiyyatın rəqabət qabiliyyətliliyinin yüksəldilməsinə və dünya təsərrüfat sisteminə səmərəli inteqrasiyasına nail olmaqla, uzunmüddətli perspektivə ölkədə dinamik sosial-iqtisadi inkişafın davamlılığını təmin etməkdən ibarətdir. Bunlara ölkənin malik olduğu iqtisadi potensialın gücləndirilməsi və bu potensialın kompleks şəkildə səmərəli reallaşdırılması, o cümlədən qeyri-neft sektorunun inkişaf etdirilməsi (neftdən asılı olmayan güclü Azərbaycan iqtisadiyyatının formalaşdırılması), hər bir regionun malik olduğu potensialdan tam və səmərəli istifadə olunması və onların inkişafının tarazlaşdırılması, çoxlu sayda yeni iş yerlərinin açılmasına şərait yaradılması, sahibkarlığın inkişaf etdirilməsi, sosial xidmətlərin həcminin, keyfiyyətinin və ünvanlılığının əhəmiyyətli dərəcədə artırılması, yoxsulluğun azaldılması kimi vəzifələri aid etmək olar [5, s. 64].

Biznes mühitinin formalaşdırılması eləcə də sahibkarlığın inkişafının sürətləndirilməsi və dövlət dəstəyinin artırılması üçün dövlət bir sıra zəruri iqtisadi siyasətlər həyata keçirməlidir. Bu cür siyasətlər investisiya mühitinin xeyli yaxşılaşması və müəssisələrin uğur əldə etmələri üçün maksimal imkanlar yaradır. Azərbaycanda dövlətin iqtisadi siyasətinin əsas istiqamətlərindən biri olan biznes mühitinin inkişafının sürətləndirilməsi məqsədilə zəruri islahatlar həyata keçirilmişdir. Bu islahatların əsas məqsədləri dövlətlə sahibkarlar arasındakı münasibətlərin inkişaf etdirilməsi, siyasi və sosial stabillik, iqtisadi siyasətin proqnozlaşdırıla bilməsi, korrupsiyanın ləğvi tədbirləri, gömrük prosedurları, biznes mühitində baş verən və sahibkarların fəaliyyətinə süni müdaxilələrin aradan qaldırılması, sahibkarlara dövlət dəstəyinin təşviqi, elektron hökumət xidmətlərinin tətbiqinin genişləndirilməsidir.

Bu istiqamətdə çox mühüm addımlar da atılmışdır. Buna misal olaraq qanunvericilik bazasının təkmilləşdirilməsi, dövlət büdcəsindən sahibkarların fəaliyyətinə əngəl olan süni müdaxilələrin aradan qaldırılması, dövlət büdcəsindən kiçik və orta sahibkarlıq subyektlərinə ayrılmış vəsaitlərin həcminin artırılması, inzibati prosedurların sadələşdirilməsi, sahibkarlara lisenziyaların müddətsiz verilməsi, vergi güzəştlərinin tətbiqi, sahibkarlıq subyektlərinin qeydiyyatının sadələşdirilib "bir pəncərə" prinsipi əsasında elektron qaydada aparılması, inhisarçılıq fəaliyyətinin qarşısının alınması, maliyyə dəstəklərinin göstərilməsi və s. [8, s. 29]

Əlverişli biznes mühitinin formalaşdırılmasında əhəmiyyətli siyasətlərdən biri də dövlətin vergi siyasətidir. Ölkəmizdə sahibkarlıq subyektlərinin vergi ödənişlərinin aparılmasını asanlaşdıran mühüm islahatlar həyata keçirilmişdir. Azərbaycanda aparılan vergi siyasətinin əsas istiqamətləri kiçik və orta sahibkarlara əhəmiyyətli vergi güzəştlərinin tətbiq olunması, özəl sektorda fəaliyyət göstərən müəsisələr üçün vergi yükünün azaldılması, vergi ödənişlərində şəffaflığı artırmaqla sahibkarlıq subyektləri ilə vergi orqanları arasındakı inamı artırmaq, biznes fəaliyyəti üçün əlverişli bir şəraitin yaradılması və son nəticədə isə mövcud iqtisadi potensialın artırılması və əhalinin maddi rifahının yüksəldilməsidir.

Praktikada dövlət vergi siyasətini müxtəlif vergi mexanizmləri vasitəsilə həyata keçirir. Vergilər ümumiyyətlə, dövlət gəlirləri artımının əsas amillərindən biridir. Gəlirlər isə hökumətlərin həyata keçirdiyi məqsədyönlü əməliyyatların maliyyələşdirməsi, eləcə də vətəndaşların təhlükəsizliyi və digər zəruri xidmətlərin təmin edilməsi üçün olduqca vacibdir. Bununla belə, ayrı-seçkiliyə yol verən, qeyri-səmərəli və ağır vergiqoyma siyasəti vergi ödəyicilərinin könüllü olaraq vergiləri ödəməsinə maneələr törədə bilir. Bu isə

vergi gəlirlərini azaldır, bəzi şirkətləri mənfi və qeyri-şəffaf təcrübələrə müraciət etməyə təhrik edir. Vergidən yayınma ilə əlaqədar potensial cərimələrin məbləğini artıraraq və düzgün korporativ idarəçilik mədəniyyətini dəstəkləyərək firmaları qeyri-qanuni fəaliyyətlərdən çəkindirmək mümkündür.

Makroiqtisadi mühitin və valyuta məzənnəsinin dəyişkənliyi ilə əlaqədar son çətinliklərə baxmayaraq, Azərbaycan infrastrukturunu təkmilləşdirərək, diqqət mərkəzini ölkənin əlverişli biznes mühitinin yaxşılaşdırılması üzərində saxlamaq fikrindədir. Ölkəmizin nəqliyyat və regional logistika mərkəzi kimi mövqeyini inkişaf etdirməsi məqsədilə hökumət Azərbaycanın müxtəlif regionlarını birləşdirən və müasir rabitə obyektlərini genişləndirən dəniz limanları və dəmiryolları ilə bağlı layihələrə investisiya qoymağı da planlaşdırır. Texnologiyanın sürətlə inkişaf etdiyi dövrdə investisiya üçün daha da əlverişli biznes mühitinin yaxşılaşdırılması əsasında səmərəli rəqəmsal infrastruktur, inkişaf və tədqiqat üçün əlverişli şəraitin və yeni texnologiyanın tətbiqi dayanır. Tarixən, dövlət sektoru ölkədəki infrastruktur investisiyalarının böyük bir hissəsini öz üzərinə götürmüşdür. Bu sahədə də dəyişiklik olması çox vacibdir. İnfrastruktur investisiyalarındakı müxtəlif çatışmazlıqları aradan qaldırmaq üçün hökumət cəlbedici investisiya və daha aydın siyasət imkanları vasitəsilə xarici investorlardan və özəl sektordan daha böyük maliyyə səfərbər etməlidir [3, s. 147].

Son illərdə sahibkarların maariflənməsi, müasir biznes metodlarına yiyələnməsi və biznes fəaliyyətini həyata keçirmə potensiallarının gücləndirilməsi sahəsində bir sıra tədbirlər görülməlidir. Sahibkarlar üçün Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi nəzdində fəaliyyət göstərən Biznes Tədris Mərkəzi tərəfindən müxtəlif təlim və seminarlar təşkil edilmişdir. Təlimlərin mövzuları sahibkarların ehtiyaclarına uyğun olaraq qurulmuşdur. Ancaq buna baxmayaraq, Azərbaycanda kiçik və orta sahibkarların bilik və bacarıqları heç də müasir tələblərə cavab vermir. Buna görə də bu sahədə səylərin daha da gücləndirilməsi çox vacibdir.

## Nəticə

Ölkəmizin gücləndirilməsi, sosial-iqtisadi inkişafın sürətləndirilməsi, yeni texnologiyaların Azərbaycanda tətbiqi, Azərbaycanın bütün sahələrində müasirləşmə meyillərinin gücləndirilməsi, sahibkarlara əlavə dəstəyin verilməsi, kənd təsərrüfatının inkişafı, ərzaq təhlükəsizliyinin tam şəkildə təmin edilməsi, bütün infrastruktur, sənaye və sosial infrastruktur layihələrinin icra edilməsi, - qısa desək, əsas istiqamətlər demək olar ki, bundan ibarətdir.

İqtisadi İnkişaf Nazirliyi ölkə prezidentinin müvafiq Fərmanına uyğun olaraq, sahibkarlıq subyektlərinin fəaliyyətinin ―bir pəncərə prinsipi üzrə təşkilinin bu sahədə mühüm addım olduğunu bildirib. Sahibkarlıq fəaliyyətinininkişafının daha da sürətləndirilməsi məqsədilə AzərbaycanRespublikası Prezidentinin "Sahibkarlıq fəaliyyəti subyektlərinin fəaliyyətinin ―bir pəncərəli prinsipi üzrə təşkilinin təmin edilməsitədbirləri haqqında" 25 oktyabr 2007-ci il tarixli 2458 nömrəli Sərəncamı qəbul edilmişdir.

Hazırda Azərbaycanda biznes mühitinin yaradılmasının konseptual əsasları hazırlanmışdır. Bununla əlaqədar, ölkədə biznes mühitinin yaradılması istiqamətində Azərbaycanın elm və təhsil ocaqları, iş adamları və beynəlxalq təşkilatlar ilə müvafiq danışıqlar aparılır. Eyni zamanda, sahibkarlığın dəstəklənməsi modellərinin(sənaye şəhərciyi, biznes-inkubator, biznes mərkəzləri və s.) yaradılması ayrıca bənd kimi ―Azərbaycan Respublikasında sahibkarlığın inkişafı Dövlət Proqramında (2008-2013-cü illər) nəzərdə tutulmuşdur.

Son illərdə ölkəmizdə iqtisadi aktivliyin bərpa edilməsi və institusional islahatların sürətləndirilməsi məqsədilə iqtisadi siyasətin təkmilləşdirilməsi istiqamətində fəaliyyət dərinləşdirilmişdir. İqtisadiyyatın inkişafı, biznes və investisiya mühitinin yaxşılaşdırılması, sahibkarlar üçün daha əlverişli imkanların yaradılması və onlara dövlət dəstəyinin gücləndirilməsi, həmçinin qeyri-neft məhsullarının ixrac potensialının artırılması istiqamətində bir çox mühüm tədbirlər reallaşdırılmışdır.

Hər bir ölkədə dövlətçiliyin və müstəqilliyin daha da gücləndirilməsi, gələcəyin etibarlı təminatı intellektual kadrların yetişdirilməsindən və gənclərin cəmiyyətin bütün sferalarında iştirakından, o cümlədən onların aparıcı qüvvələrə çevrilməsindən çox asılıdır. Azərbaycanın mövqelərinin möhkəmlənməsində çox mühüm rol oynayan amillərdən biri də daha güclü, ixtisaslı və innovativ işçi qüvvəsidir. Azərbaycan gənclərinin bugün bütün sahələrdə özünü göstərmələri üçün onlara şərait yaradılması olduqca vacib məsələdir. Gənclərin inkişafı dövlətin diqqətində olan bir məsələdir. Gənclər sadəcə elm, mədəniyyət, ədəbiyyat və istehsalat sahəsində deyil, həmçinin biznes və sahibkarlıqda da özlərini göstərə bilirlər. Onlarla iş sahəsində görülən məqsədyönlü tədbirlər Azərbaycan gəncliyinin davamlı inkişafına təkan verir və onların cəmiyyətdə özlərini təsdiq etmələrində mühüm rol oynayır.

**Ədəbiyyat**

1. A.Abbasov. Biznesin əsasları. Bakı, «Nurlan», 2005. - 656 səh.
2. A.B.Abbasovun ümumi redaktəsi ilə. "Biznesin təşkili və idarə edilməsi" Dərslik. Bakı. 2011., 464 səh
3. Anar Bayramov. Biznes və menecmentin əsasları. Bakı, "Elm və təhsil", 2011, 184 səh.
4. Əyyub Əyyubov. Biznes sistemləri, yolları və prinsipləri. Sahibkar fəaliyyətinin anatomiyası. Bakı: Sabah, 1995 128 s.
5. P. Fərhadi. Beynəlxalq biznes. ali məktəblər üçün dərs vəsaiti. Bakı: [Bakı Biznes Universiteti], 2017. 297
6. Əliyev M.Ə "Biznesin təşkili və idarə edilməsi" Baki 2010
7. Gauntlett D.A. Insurance Coverage of Intellectual Property Assets, CCH Incorporated, 2013, 1512 p.
8. Şiryayev V.İ., Şiryayev Y.V "Biznes prosesləri idarəetmə" Bakı 2013

**Rəyci: prof. Ş.Səmədova**

Göndərilib: 03.09.2020 Qəbul edilib: 05.09.2020

DOI: 10.36719/AEM/2007-2020/57/109-116

**Ələkbər Göyüş oğlu Əlverdiyev**
Bakı, Azərbaycan
aliakbar.alverdiyev@gmail.com

# BÜDCƏ İDARƏÇİLİYİNİN İNKİŞAFININ ƏSAS İSTİQAMƏTLƏRİ VƏ ONUN SƏMƏRƏLİLİYİNİ ARTIRAN AMİLLƏR

**Xülasə**

Məqalədə yeni büdcə mexanizminə keçidin aktuallığı ifadə edilir və bu mexanizmin tətbiqinin büdcə qanunvericiliyinə, büdcə sisteminə və büdcə prosesinə təsiri araşdırılır. Yeni yanaşmalar nəticəsində, xüsusən büdcənin xərclər hissəsində həm nəzarət güclənəcəkdir, həm də səmərəlilik artacaqdır ki, bunlarda mövzunun çox aktual olduğunu göstərir. Eyni zamanda məqalədə bu istiqamətdə müvafiq işi aparan nazirliklərə müəyyən tövsiyələr hazırlanmışdır ki, bu tövsiyələrin nəzərə alınması yararlı ola bilər.

***Açar sözlər**: büdcə, büdcə prosesi, nəticələrə yönəlik büdcələşmə, ortamüddətli büdcə planlaşdırılması, proqram-məqsədli metod*

## Main directions of developing of budgeting management and the factors of increasing its efficiency

**Summary**

The article highlights the urgency of the transition to a new budget mechanism and examines the impact of this mechanism on budget legislation, the budget system and the budgeting process. As a result of new approaches, especially in budget expenditures, the control will be activated, and the effectiveness will increase, which indicates that the problem is very urgent. At the same time, some recommendations have been developed for ministries involved in relevant work in this regard, so it may be useful to take these recommendations into account.

***Key words**: budget, budget process, results-oriented budgeting, medium-term budget planning, program-target method*

## Giriş

Dövlət maliyyəsinin əsasını təşkil edən büdcə idarəçiliyində indiki dövrə kimi ənənəvi (xərc) büdcələşmə metodundan istifadə edilməkdədir ki, burada da ciddi problemlər müşahidə edilir. Bu metoddan istifadədə əsas məqsəd maliyyə resurslarının məqsədli və təyinatı üzrə xərclənməsini təşkil etməkdir və nəticə etibarilə maliyyə resursları təyinatı üzrə istifadə edilir. Bu metod dünya praktikasında bir çox ölkələrdə, xüsusilə MDB məkanı ölkələrində tətbiq edilir, lakin yüksək nəticələrin və səmərənin əldə olunması heç də asan məsələ hesab olunmur [4]. Başlıca çatışmazlıq kimi dövlət maliyyə idarəetməsində olan digər strukturların, xüsusilə nazirliklərin məsuliyyət yükünün çox az olması və onların təşəbbüskarlıq ideyasından uzaq qalması vacib amil kimi nəzərə çarpır. Eyni zamanda, maliyyə qərarlarının qəbul edilməsi məsuliyyətini birbaşa yuxarı səviyyələrdə dayanan qurumlar daşıyır ki, bu zaman əlavə problemlərin mövcudluğu nəticəsində daha dəqiq qərarların qəbul olunması mümkün olmur. Tamamilə mərkəzləşmiş idarəçiliyin fəsadları olduqca böyük olur və vəsaitlərin əsassız şəkildə xərclənməsi üçün ciddi stimullar olur. Azərbaycanda büdcə planlaşdırılması, ictimai maliyyə vəsaitlərinin istifadəsi və nəzarət məhz ənənəvi (xərc) büdcələşdirmə modeli əsasında aparılır ki, bu da bəzi problemlərin yaranmasına gətirib çıxarır. Bu baxımdan artıq yeni yanaşmalara, üsullara müraciət edilməli və dövlət maliyyəsinin idarə edilməsində ciddi islahatlar aparılmalıdır. Dövlət maliyyəsinin idarə edilməsi üzrə yeni dövrün çağırışlarına cavab verən çevik idarəçilik modelinin formalaşdırılması üçün dövlət büdcəsinin xərclər hissəsinin təsnifləşdirilməsinin daha dəqiq və aydın şəkildə təkmilləşdirilməsinə nail olunmalı, xərcləmələr üzrə yeni mexanizmlər işlənməli, fəaliyyət istiqamətləri oxşar olan və bir-birini təkrarlayan dövlət qurumlarının konsolidasiyası aparılmalı, dövlət aparatının saxlanılması xərcləri maksimum dərəcədə optimallaşdırılmalı və büdcə yükünün azaldılması istiqamətində addımlar atılmalıdır. Əsas islahat büdcə sistemindən başlamalı və büdcənin hər qəpiyinin hesabatlılığını təmin etməyə imkan verən nəticəyə yönəlik büdcə mexanizmi və proqram-məqsədli metodun tətbiqinə şərait yaradan yeni büdcə qanunvericiliyi qəbul edilməli və büdcəyə səmərəli nəzarəti təmin edə bilən yeni funksiyalar yaradılmalı və müvafiq orqanların səlahiyyətlərinə daxil edilməlidir. Daima maliyyə problemlərini yaşayan bir çox ölkələr və ABŞ təcrübəsi göstərir ki, proqram-məqsədli metodun tətbiqi ilə büdcə kəsirinin hətta yüksək səviyyədə olduğu şəraitdə belə büdcə idarəçiliyində ciddi problemlər yaşanmır. Proqram-məqsədli metodun növləri kimi "inzibati" və "müqavilə" modelindən istifadə olunur [7]. Müqavilə modelində müxtəlif müsabiqələr keçirilir və təxsisatların bölgüsü ciddi rəqabət mexanizminin

mövcudluğu şəraitində aparılır. Bu modeldən Böyük Britaniya, Avstraliya, Yeni Zelandiya, Kanada, Cənubi Afrika və Skandinaviya ölkələri istifadə edir. Bu model daha çox dövlət idarəetməsində parlament idarəçiliyinə sahib olan ölkələr üçün xarakterikdir. Yuxarı orqanların qərarları əsasında qəbul edilən və aktlarda nəzərdə tutulmuş şəkildə icra olunan proqramlar isə inzibati modelə aid olunur. Burada çox sayda olmayan (adətən 100-150 proqram) proqramlar icra olunur və dəqiq şəkildə nəzərdə tutulan nəticələrə əsasən xərclərin strukturu müəyyən edilir. İnzibati model Rusiyada, İtaliyada, Fransada, Braziliya istifadə olunur və belə bir model əsasən dövlət idarəetməsində prezident idarəçiliyinə sahib olan ölkələr üçün xarakterikdir. Proqram-məqsədli metod nəticəəsaslı büdcə mexanizminin tərkibində ən ciddi təsirlərə malik bir metoddur. Nəticəəsaslı büdcə mexanizmində xərclər proqramlara, xidmətlərə, fəaliyyətlərə və onun nəticələrinə bağlanır. Planlaşdırma yuxarıdan-aşağıya prinsipi əsasında aparılır. Yuxarıdan-aşağı prinsipində mərkəzləşdirilmiş idarəetmə aparatından bütün digər nazirliklərə maliyyələşdirməylə bağlı məhdudiyyətlər tətbiq edilir və nazirliklər ortamüddətli planlaşdırılma dövründə bu məhdudiyyətlərin çərçivəsindən kənara çıxa bilmirlər. Bu cür yanaşma ilə mövcud olan resurslara əsasən etibarlı və əsaslı proqnozlar verilir ki, bütün bu proqnozlar dəqiq makroiqtisadi qiymətləndirilmə əsasında meydana çıxır. Həddindən artıq olan optimistik proqnozların verilməsinin qarşısını alınması üçün elə mexanizmlər olmalıdır və yaradılmalıdır ki, inzibati və siyasi təzyiqlər minimuma endirilsin.Bu planlaşdırmadan istifadə edən ölkələr arasında İsveçi qeyd etmək olar ki, onlar artıq 15 ildir ki, aşağıdan-yuxarıya prinsipini ləğv etməklə, birbaşa yuxarıdan-aşağıya prinsipinə keçidi təmin etdilər və kifayət qədər əla nəticələr əldə edə bildilər.

**Dövlət büdcəsinin gəlir və xərc hissəsinin təhlili.** İlk öncə qeyd edək ki, müasir dövrdə dövlət büdcəsinin təşkili və idarə edilməsində planlaşdırılma və proqnozlaşdırılma ən vacib məsələ kimi diqqəti cəlb edir. Məlumdur ki, büdcə vasitəsilə ÜDM-in yenidən bölgüsü baş verir və burada büdcə gəlirlərinin yaradılması və bu vəsaitlərdən istifadə təşkil edilir. Məlumdur ki, büdcə mexanizmi vasitəsilə maliyyə vəsaiti toplanarkən və istifadə olunan zaman dövlətlə hüquqi və fiziki şəxslər arasında maliyyə münasibətləri yaranır. Bu maliyyə münasibətləri dövlətin maliyyə-büdcə siyasəti tədbirlər sistemi vasitəsilə tənzimlənir. Büdcə siyasəti ÜDM-in büdcə vasitəsilə istifadə edilən hissəsini tam müəyyən edir və bu siyasət nəticəsində büdcə xərclərinin strukturu və onun müxtəlif büdcə həlqələri arasında bölüşdürülməsi, büdcə kəsiri, dövlət borcununun idarə edilməsi məsələləri tam şəkildə müəyyən edilir. Sirr deyildir ki, ölkəmizdə son illərdə ÜDM-in artım tempində neft gəlirlərinin təsiri açıq aşkar olmuşdur. ÜDM-in artması xüsusilə, 2000-ci ildən etibarən büdcə göstəriciləri çərçivəsində daima gəlir və xərclərin artımına şərait yaratmışdır. Aşağıdakı cədvəldə ilkin olaraq ölkəmizin illər üzrə büdcə göstəricilərinə nəzər yetirək:

**Cədvəl 1.**

**2000-2018-ci illər üzrə dövlət büdcəsinin əsas göstəriciləri, milyon manatla**

| Göstəricilər | 2000 | 2006 | 2010 | 2012 | 2013 | 2014 | 2015 | 2016 | 2018 |
|---|---|---|---|---|---|---|---|---|---|
| Ümumi daxili məhsul ( nominal ÜDM) | 4718.1 | 18746.2 | 42465.0 | 54743.7 | 58182.0 | 59014.1 | 54352.1 | 60393.6 | 79797.3 |
| Dövlət büdcəsinin gəlirləri | 714.6 | 3868.8 | 11403.0 | 17281.5 | 19496.3 | 18400.6 | 17498.0 | 17505.7 | 22508.9 |
| Dövlət büdcəsinin xərcləri | 764.0 | 3790.1 | 11765.9 | 17416.5 | 19143.5 | 18709.0 | 17784.5 | 17751.3 | 22731.6 |
| Dövlət büdcəsinin kəsiri (-) və ya profisiti (+) | - 49.4 | 78.7 | - 362.9 | - 135 | 352.8 | - 308.4 | - 286.5 | - 245.6 | - 222.7 |
| Dövlət büdcəsi kəsirinin ÜDM-də çəkisi, faizlə | 1 | - | 0.9 | 0.2 | - | 0.5 | 0.5 | 0.4 | 0.3 |

**Mənbə: Statistika Komitəsinin materialları əsasında hazırlanmışdır.**

Göstəricilərə baxaraq qeyd etmək olar ki, ümumi daxili məhsul, dövlət büdcəsinin gəlirləri, dövlət büdcəsinin xərcləri daima artım tempi göstərmişdir. Lakin 2015 və 2016-cı illərdə bu göstəricilərdə geriləmələr müşahidə olunmağa başladı. Əsas səbəblərdən biri kimi 2015-ci ildən etibarən qlobal iqtisadi

artımın zəifləməsi və dünya əmtəə (enerji) qiymətlərinin kəskin şəkildə ucuzlaşması hesab olunmuşdur. 2016-cı ildə isə bu proses daha da mürəkkəbləşmişdir. Beləliklə 2016-cı ildə dünya ölkələri üzrə ÜDM-in real artım tempi 2014-cü illə müqayisədə 0.3% azalaraq 3.1% təşkil etmişdir. Azərbaycan iqtisadiyyatının da dünyadan təcrid olunmadığını və qlobal proseslərdən kənar qalmadığını ifadə edərək görə bilərik ki, son nəticədə ölkəmizdə 2014-ci illə müqayisədə 2015-ci ildə ÜDM-də geriləmə baş vermiş, büdcə kəsiri müşahidə olunmuş və dövlət büdcəsinin kəsiri ÜDM-də 0.5 % təşkil etmişdir. Neftin qiymətinin aşağı düşməsi ilə ölkə iqtisadiyyatına dəymiş mənfi təsirlərdən başqa son illərdə neft sektoru üzrə real artım tempi də müşahidə edilməmişdir. ARDNŞ (SOCAR) şirkətinin verdiyi məlumatlara görə, 2016-cı ildə ölkə üzrə neft hasilatının həcmi 41034.5 min ton (2015-ci ildə 41586.0) təşkil etmişdir ki, bu göstərici 2016-cı ilin büdcə zərfinə daxil olan məlumatlarda göstərilən neft hasilatının proqnozlaşdırılan həcmi (40744.9 min ton) göstəricisinə yaxın bir göstərici olmuşdur. Statistik məlumat bazasının təhlili göstərir ki, ümumiyyətlə neft hasilatının pik həddi 2010-cu ildə baş vermis və bu rəqəm 50795.5 min ton təşkil etmişdir. Beləliklə 2016-cı il üzrə hasilat 2010-cu illə müqayisədə 19.2% azalmışdır. 2018-ci ildə yenidən dövlət büdcəsinin gəlirləri və xərcləri üzrə ciddi artımlar müşahidə edilmişdir, lakin burada müəyyən risklər mövcuddur. Belə ki, əvvəlki illərlə müqayisədə 2018-ci ildə büdcə xərclərinin artım tempi nominal ÜDM-in artım tempini 15.8 faiz bənd üstələmişdir. Dövlət xərcləmələrinin artımı fonunda ÜDM-in artımının zəif olması onu göstərir ki, məcmu təklif artır, onun müqabilində isə tələb hələ formalaşmamışdır. Bu, o deməkdir ki, bir neçə ildən sonra büdcəni azaltmaq lazım gəlsə, ÜDM-in həcmində kəskin azalma baş verə bilər.

Dövlət büdcəsinin icrası haqqında hesabatlara nəzər salaraq qeyd edək ki, xüsusilə 1995-2000-ci illər arasında büdcənin icrasında daima kəsir müşahidə edilmişdir. Əsas səbəblər gəlirlərin aşağı səviyyədə olması, planlaşdırmanın lazımi səviyyədə təşkil edilməməsi, xərclər üzərində nəzarət mexanizmlərinin olmaması, dövlət büdcəsi üzrə qanunvericiliyin həmin dövrün tələblərinə cavab verməməsi hesab olunur. 1995-ci ildən etibarən xəzinədarlıq sisteminin mərhələli tətbiqinin başlaması belə mövcud vəziyyətə birdən birə ciddi təsir edə bilməzdi. 1999-cu ilin 18 may tarixində isə "Dövlət büdcəsi haqqında" Azərbaycan Respublikasının xüsusi qanunu qəbul edilmişdir ki, bu qanun "Büdcə sistemi haqqında" ilk qanuna kömək məqsədi daşımışdır. Xəzinədarlıq sisteminin tədricən formalaşdırılması və neft fondunun vəsaitlərinin 2000-ci ilin əvvəlindən etibarən büdcəyə girişinin təmin edilməsi nəticəsində artıq hökumət sonrakı illərdə bir çox problemləri asanlıqla həll etməyə başlayacaqdır. Xəzinədarlıq sisteminin mövcudluğu birinci növbədə maliyyə vəsaitlərinin idarə edilməsi üzrə düzgün maliyyə planlaşdırmasının tətbiqi ilə nəticələndi və burada büdcə kəsirinin ya aradan qaldırılması, ya da kəsirin minimallaşdırılmasına nail olundu. Azərbaycanda qurulan xəzinədarlıq sistemi ilk növbədə Maliyyə Nazirliyinə birbaşa olaraq büdcə gəlirlərinin və xərclərinin, pul-valyuta vəsaitlərinin dəqiq bölgüsünü aparmağa şərait yaratdı. Bu funksiyaların reallaşması çərçivəsində xəzinədarlıq orqanları burada statistik olaraq aylıq, rüblük, illik proqnozlar verir.

**Ortamüddətli büdcə planlaşdırılması, nəticəsaslı büdcə mexanizmi, proqram-məqsədli metod.** Son illər ərzində dünya ölkələrində yayılmış büdcə ilə bağlı əsas islahat ortamüddətli büdcə planlaşdırılmasının tətbiq edilməsidir. Ortamüddətli büdcə planlaşdırılması zamanı ortamüddətli (perspektiv) büdcə plan sənədi hazıranır ki, bu sənəddə minimum üç il ərzində aparılmış büdcə proqnozları ilə səfərbər ediləcək bütün büdcə gəlirlər haqqında informasiya və ortamüddətli dövr üçün əldə ediləcək bütün borclar və büdcənin xərcləri haqqında bütün lazımi məlumatlar mövcud olur. İnkişaf etmiş ölkələr praktiki olaraq ortamüddətli planlaşdırma metodlarından istifadə etməyə başladılar ki, bu da büdcə ilində təyinatlar üzrə xərclərin idarə olunması prinsipinin proqram-məqsədli metod əsasında yaranan nəticələrin idarə olunması prinsipi ilə əvəzlənməsinə şərait yaratdı. Fikrimizcə, dövlət büdcəsinin icrası mərhələsinə nəzarət edən orqanlar (Dövlət Xəzinədarlıq Agentliyi və Dövlət Maliyyə Nəzarəti Xidməti) artıq yalnız xərclər üzrə nəzarəti həyata keçirməməlidir, həm də qarşıya qoyulan məqsədlər üzrə nəticələrin əldə olunması ilə bağlı maliyyə nəzarətini həyata keçirməli olacaqdır ki, bu islahatın aparılması artıq maliyyə nəzarəti anlayışının mahiyyətini dəyişəcəkdir.

Azərbaycanda büdcə sistemi üzrə vəsaitlərin hərəkəti yaradılmış xəzinədarlıq sistemi üzrə nəzarətdə saxlanılır. Xəzinədarlıq sistemi bir maliyyə kateqoriyası olaraq dövlət maliyyəsinin əsasını təşkil edən büdcə iqtisadi kateqoriyası ilə birbaşa qarşılıqlı əlaqədədir, ona görə də büdcə daxilində yeni islahatların, yanaşmaların, mexanizmlərin, alətlərin tətbiqi xəzinədarlıq sisteminin fəaliyyətində də yeni dəyişikliklərin yaranmasına səbəb ola bilər. Fikrimizcə, Azərbaycanda büdcə və xəzinədarlıq sistemi ilə bağlı olan islahatların mərkəzində aşağıda qeyd olunan əsas istiqamətlər dayanmalıdır:

--- Nəticələrə yönəlik büdcələşdirmə mexanizminin tətbiqi;
--- Ortamüddətli xərc çərçivələrinin tətbiqi;
--- Proqram-məqsədli metodun tətbiqi
--- Dövlət büdcəsinin icrası üzrə büdcə uçotunda hesablama metodunun tətbiqi.

Yuxarıda qeyd edilən istiqamətlər üzrə inkişafa nail olmaq üçün ölkəmizdə vahid büdcə təsnifatı, mühasibat uçotu, öhdəliklərin qəbul edilməsi, proqram-məqsədli metodun yaradılması və tətbiqi, ortamüddətli maliyyə planlaşdırılması üzrə təkmilləşdirmələr aparılmalı, yeni normativ sənədlər qəbul edilməli, mövcud olan sənədlər üzrə lazımi dəyişikliklər aparılmalıdır. Bəzi ölkələrin praktikasında qeyd olunur ki, bu istiqamətlər üzrə kompleks tədbirlərin paralel şəkildə aparılması olduqca çətin bir məsələ hesab olunur və bu istiqamətlərin tam tətbiqi üçün müəyyən bir dövr hədəf götürülməli və burda pillə-pillə işlər görülməlidir.

Göstərilən istiqamətlər üzrə ciddi bir şəkildə müvafiq qərarların qəbuluna da başlanılmışdır. Belə ki, ölkə Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə strateji yol xəritəsi“ sənədində konkret olaraq görüləcək tədbirlər siyahısında ortamüddətli xərc çərçivələrinin yaradılması, nəticələrə yönəlik büdcələşdirmə mexanizminin yaradılması və tətbiqi ön plana çəkilmişdir [2]. Qarşıya qoyulan hədəflər çərçivəsində ən vacib məsələ hər iki istiqamət üzrə atılan addımların ümumi büdcə sistemində, dövlət büdcəsi icrası sistemində hansı yeniliklərə səbəb olacağı və xəzinədarlıq sistemində hansı dəyişikliklərin müşahidə olunması ilə bağlı olacaqdır.

Ortamüddətli xərc çərçivəsi, nəticələrə yönəlik büdcələşdirmə, proqram-məqsədli metod dövlət büdcəsinin idarə edilməsi üzrə tamamilə yeni bir yanaşma formalaşdıracaqdır. Bu islahat nəticəsində xəzinədarlıq sistemi daxilində xüsusilə, büdcənin xərclər üzrə icrası zamanı bəzi dəyişikliklərin baş verəcəkdir və fikrimizcə, bu dəyişikliklər aşağıdakılar kimi olacaqdır:

--- xəzinədarlıq orqanları burada büdcə xərcləri üzrə dövlətin adından büdcə təşkilatları qarşısında onların məqsədli proqramları üzrə öhdəlikləri qəbul edəcəkdir və burada artıq uzunmüddətli öhdəliklərin də qəbulu baş verəcəkdir;

--- uzunmüddətli öhdəliklərin mövcudluğu zamanı xərclər üzrə dövlət büdcəsinin icrasında uzunmüddətli müqavilələrin qeydiyyatı reallaşdırılacaqdır;

--- xəzinədarlıq orqanları vahid büdcə təsnifatı daxilində yaradılmış prioritet təşkil edən proqram təsnifatı üzrə müxtəlif xərc əməliyyatlarını aparacaqdır;

--- büdcə proqramları üzrə tələb olunan büdcə vəsaitlərinin xəzinədarlıq orqanları qarşısında əsaslandırılması və qiymətləndirilməsi baş verəcəkdir;

--- xəzinədarlıq orqanları icra edilən proqramlar çərçivəsində həm uçot funksiyalarını yerinə yetirə bilər, həm də proqramların icrası üzrə yaranan nəticələri və göstəriciləri üzrə qiymətləndirmə imkanlarına sahib ola bilərlər.

Nəticələrə yönəlik büdcə mexanizmi dövlət büdcəsinin icrası mərhələsi üzrə üzrə planlaşdırmanın, icranın, nəzarətin elə bir metodologiyasını özünə daxil edir ki, dövlətin iqtisadi siyasətində olan prioritetlərdən asılı olaraq büdcə xərclərinin bölüşdürülməsi və istifadəsi cəmiyyətdə gözlənilən konkret nəticələrin əldə olunmasına şərait yaratmalıdır. Nəticələrə yönəlik büdcə mexanizmində büdcə xərclərinin planlaşdırılması aparılarkən xüsusilə proqram-məqsədli büdcələşdirmə metodundan xüsusilə istifadə olunur. Burada orta və uzunmüddətli büdcə planlaşdırması proqram-məqsədli metoda əsaslandıqda daha effektiv olur. Bu üsul büdcə planlaşdırmasının ölkənin sosial-iqtisadi inkişafının proqnozlaşdırılması və uzunmüddətli məqsədli proqramlarla inteqrasiya edilməsini nəzərdə tutur. İslahatların aparılmasını təmin etmək baxımından bu proqramların formalaşması, reallaşdırılması və onların nəticələrini qiymətləndirmək üçün müvafiq metodoloji bazanın və hüquqi sənədlərin hazırlanması və qəbul edilməsi zəruridir.

Proqram-məqsədli metodun tətbiqi üçün əlbəttə ki, vahid büdcə təsnifatında ayrıca proqram təsnifatının yaradılması labüddür. Ona görə də, ölkəmizdə 2005-ci ildən qüvvədə olan vahid büdcə təsnifatına yenidən baxılmalıdır və burada burada büdcə xərclərinin proqram təsnifatı yaradılmalıdır. Bu təsnifatın daxilində proqramlar, alt-proqramlar üzrə qruplaplaşdırılma aparılmalı və bu proqramların adı təsbit edilməli və həyata keçiriləcək illər dəqiq qeyd edilməlidir. Qəbul ediləcək yeni vahid büdcə təsnifatında mütləq büdcə kəsrinin maliyyələşmə mənbələri və dövlət borcu (daxili və xarici) üzrə ayrıca təsnifatda mütləq yaradılmalıdır. Aşağıdakı cədvəl vasitəsilə büdcə təsnifatının tərkibini müxtəlif ölkələr üzrə müqayisə edə bilərik [11] :

**Cədvəl 2.**

**Müxtəlif ölkələrdə büdcə təsnifatının tərkibinin müqayisəli təhlili**

| Təsnifat / Ölkələr | İqtisadi | Funksional | İnzibati | Büdcə kəsrinin maliyyələşmə mənbələri | Proqram | Digər |
|---|---|---|---|---|---|---|
| Albaniya | Var | Var | Var | Var | Var | Coğrafi (regional, yerli və s.) |

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| Azərbaycan | Var | Var | Var | - | - | Gəlirlərin təsnifatı |
| Gürcüstan | Var | Var | Var | - | - | Maliyyə və qeyri-maliyyə aktivlərinin təsnifatı |
| Qazaxıstan | Var | Var | Var | Var | - | - |
| Kosovo | Var | - | Var | Var | Var | Layihə |
| Qırğızıstan | Var | Var | Var | - | - | - |
| Moldova | Var | Var | Var | - | Var | İnvestisiya subyektləri üzrə donorların təsnifatı |
| Çernoqoriya | Var | Var | Var | Var | Var | Layihə |
| Serbiya | Var | Var | Var | Var | Var | Alt-proqram |
| Tacikistan | Var | Var | Var | Var | - | - |
| Ukrayna | Var | Var | Var | Var | Var | Gəlir təsnifatı, Yerli büdcələrin xərcləri üzrə müvəqqəti təsnifat |

**Mənbə:** Pempal.org

Müqayisə aparsaq görərik ki, bir çox ölkələr büdcə təsnifatının tərkibində proqram təsnifatını yaratmış və büdcənin icrasını səmərəli təşkil etmək üçün ondan istifadə edirlər. Bütün ölkələr bir qayda olaraq büdcə təsnifatında funksional, iqtisadi, inzibati təsnifatdan istifadə edirlər. Dövlət büdcəsinin icrasını nəzarətdə saxlamaq üçün isə birbaşa olaraq iqtisadi təsnifata üstünlük edirlər. Lakin proqram təsnifatı yaradılarsa büdcənin icrası zamanı səmərəliliyin əldə olunması üçün həm proqram, həm də iqtisadi təsnifat xüsusilə nəzarətdə saxlanılmalıdır.

Nəticəsaslı büdcə mexanizminə keçid təmin edildikdə büdcə uçotu üzrə də müəyyən yeniliklər edilməlidir. Azərbaycanda dövlət büdcəsinin icrası zamanı büdcə uçotu üzrə xəzinədarlıq modifikasiya edilmiş kassa metodundan istifadə edir. Müasir zamanda qərb ölkələrində artıq birbaşa olaraq hesablama metoduna keçid tamamilə təmin edilmişdir [8]. Baxmayaraq ki, nəticəsaslı büdcə mexanizmi və proqram-məqsədli metoddan istifadə zamanı büdcə uçotunda hesablama metodundan yox, kassa metodundan istifadə davam etdirilə bilər. Nəticələrə yönəlik büdcələşdirmədə ölkələr birbaşa olaraq hesablama metodunu tətbiq edir ki, hesablama metodunda vəsaitlərin daxilolması və ya ödənişlərin aparılması tarixindən asılı olmayaraq əməliyyat və hadisələr baş verdiyi məqamlarda qeydə alınacaqdır. Hesablama metodunun tətbiqi nəticəsində dövlət onun aktivləri və öhdəlikləri barədə daha geniş informasiya əldə etmiş olacaqdır. Kreditor borcların daha yaxşı idarə edilməsi baxımından planlaşdırma və dövlət büdcəsinin icrası zamanı hesablama metodundan istifadə önəmlidir. Hesablama metodunda öhdəliklərin qəbulu artıq xərc kimi əvvəldən tanınır və faktiki xərclərdən qabaq onların qeydiyyatı aparılır. Hesablama metodu vasitəsilə öhdəliklər barədə daha geniş bir əhatəyə malik məlumatlar əldə etmək mümkün olacaqdır. Burada balans hesabatı təşkil olunan zaman aktiv hesablar yaradılır və aktiv hesabların tərkibində dövlət gəlirləri, dövlət mülkiyyətində olan bütün material və qeyri-material aktivlər tamamilə əks olunur. Balans hesabatın digər hissəsi olan passiv hesablarda isə xərc maddələri qeyd olunur. Hesablama metodu vasitəsilə yaradılan aktiv və passiv hesabların bərabərliyi çərçivəsində cari büdcə ilində kassa xərclərinin hədlərini hesablamaq mümkün olacaqdır. Azərbaycanda dövlət büdcəsinin icrası mərhələsi zamanı büdcə təşkilatları təsdiq edilmiş smeta çərçivəsində ayrılan vəsaitləri hal-hazırda uçotun hesablama metodu əsasında icra edirlər. Beləliklə də, büdcə təşkilatları proqramlar çərçivəsində büdcə vəsaitlərindən istifadə zamanı hesablama metodunun tətbiqi üzrə ciddi problemlər yaşamayacaqdır.

**Dövlət büdcəsinin icrasında uçot və hesabatlılıq.** Dövlət büdcəsinin icrası mərhələsində uçot elə bir vasitədir ki, bu zaman dövlətin bütün pul vəsaitlərinin hərəkəti bütövlükdə qeydə alınır və bütün maliyyə əməliyyatları müvafiq kitablarda əks etdirilərək sonda büdcə hesabatının hazırlanması üçün şərait yaradır. Dövlət büdcəsinin icrasının uçotunu büdcə uçotunun tərkibinə daxil etmək olar ki, buraya büdcə təşkilatlarının gəlir və xərc smetasının icrasının uçotu da daxildir. Hazırda Azərbaycanda xəzinədarlıq sistemində büdcə uçotunun təşkili və aparılması təmin olunur ki, burada büdcə uçotunun hər iki tərəfinə ciddi nəzarət təmin olunur. Ənənəvi olaraq büdcə uçotuna elə bir sistem kimi baxılır ki, burada dövlətin bütün pul vəsaitlərinin daxilolma və xaricolma əməliyyatlarının qeydiyyatı aparılır [8].

Dövlət büdcəsinin icrasının uçotu, həm də büdcə təşkilatlarının gəlir və xərc smetasının icrası mühasibat uçotunun hesablar planına əsasən aparılır. Dövlət büdcəsinin icrasını aparan orqan (adətən xəzinədarlıq) və büdcə təşkilatları üçün vahid hesablar planının mövcud olması daima aktual məsələ kimi diqqəti çəkir. Beynəlxalq təcrübədə hökumət sektorunda mühasibat uçotunun hesablar planı indi elə bir şəkildə hazırlanır ki, büdcə təsnifatı hesablar planının əsas komponenti olmalıdır. İqtisadi təsnifat burada xüsusilə böyük rol oynayır ki, bu təsnifat hesablar planının əsas elementi kimi özündə büdcələşdirmə, mühasibat uçotu, büdcə-vergi təhlili və statistik hesabatlılığı özündə birləşdirir.

Dövlət büdcəsinin icrası haqqında tam və əhatəli hesabatlılığın təmin edilməsi Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2004-cü il 6 oktyabr tarixli 149 nömrəli Qərarı ilə təsdiq edilmiş Vahid Büdcə Təsnifatının təkmilləşdirilməsindən birbaşa asılıdır və burada proqram təsnifatı əlavə edilməklə yanaşı, həm də eyni zamanda iqtisadi və funksional təsnifat beynəlxalq təcrübədə istifadə edilən Dövlət Maliyyə Statistikasının (DMS) tələblərinə tam şəkildə uyğunlaşdırılmalıdır.

**Dövlət büdcəsinin icrası üzrə avtomatlaşdırma və elektron tətbiqetmə.** Dövlət büdcəsinin icrası və büdcə uçotunun beynəlxalq praktikada nəzərdə tutulan şəkildə aparılması üçün ölkəmizdə bu istiqamət üzrə avtomatlaşdırılma aparılmışdır. Qeyd etmək lazımdır ki, Xəzinədarlıq üzrə İnformasiya İdarəetmə Sistemi (XİİS) vahid büdcə təsnifatının ən vacib hissəsi olan iqtisadi və funksional təsnifatı tamamilə əhatə edir [3] . XİİS-də iqtisadi təsnifat üzrə birinci sırada gəlirlər, ikinci sırada xərclər, üçüncü sırada qeyri-maliyyə aktivləri, maliyyə aktivləri, öhdəliklər dayanır.

Aktivlərin xalis dəyərinin artmasına gətirib çıxaran əməliyyatlar büdcə gəlirləri kimi təsnifləşdirilmişdir. Bura vergilər, sosial ayırmalar, qrantlar, digər gəlirlər daxildir. Aktivlərin xalis dəyərinin azalmasına gətirib çıxaran bütün əməliyyatlar büdcə xərcləri kimi təsnifləşdirilmişdir. Bura əməyin ödənişi, malların (işlərin və xidmətlərin) satın alınması, köhnəlmə, faiz üzrə ödənişlər, subsidiyalar və cari transferlər, qrantlar və digər ödənişlər, təqaüdlər və sosial müavinətlər, digər xərclər daxildir.

Qeyri-maliyyə aktivlərinin satın alınması, maliyyə aktivləri ilə əməliyyatlar, öhdəliklər üzrə maliyyə əməliyyatları xərc kimi tanınmır və aktivlərin xalis dəyərinə onların heç bir təsiri yoxdur. Ehtiyatların və ya pul və saitlərinin dəyişilməsinə təsir edən əməliyyatlar, mühasibat müxabirləşməsi formasında Baş Kitabın hesablarında öz əksini tapır. Bu hesablara gəlir hesabları, xərc hesabları, öhdəlik və aktivlərin həcm və dəyərinin dəyişilməsini əks etdirən hesablar, balans hesabları (bu hesablara maliyyə aktiv və öhdəliklərinin, həmçinin qeyri-maliyyə aktivlərinin uçotu üzrə hesablar aid edilir) daxildir. Qeyd etmək lazımdır ki, büdcə gəlirləri və xərcləri üzrə təsnifat bu hesablar sistemində əks olunmur. Bu hesablar planı iqtisadi təsnifatı tamamilə əhatə edir və beynəlxalq təcrübədə hesablar planı əsasən iqtisadi təsnifat əsasında yaradılır. Aşağıdakı cədvəl vasitəsilə XİİS-də Baş kitabın hesablar planının ümumiləşdirilmiş formasına nəzər yetirək [3]:

**Cədvəl 3.**

**XİİS-də Baş kitabın hesablar planı**

| Baş kitabın hesabları | | |
|---|---|---|
| 1. | Gəlir hesabları | Nəticə hesabları |
| 2. | Xərc hesabları | Nəticə hesabları |
| 3. | Dəyərin dəyişilməsi hesabları | Nəticə hesabları |
| 4. | Həcmin dəyişilməsi hesabları | Nəticə hesabları |
| 5. | Balans hesabları | Balans hesabları |

**Mənbə: Maliyyə Nazirliyinin 13 fevral 2013-cü il tarixli "İ-25"№-li Əmri ilə təsdiqlənən XİİS-in tənzimlənməsi üzrə metodiki sənəd əsasında hazırlanmışdır.**

Gəlir, xərc, dəyərin dəyişilməsi, həcmin dəyişilməsi hesabları nəticə hesablarına aiddir. Növbəti maliyyə ilinə keçdikdə bütün hesablar bağlanır və onların qalığı, son nəticə hesabı olan aktivlərin xalis dəyəri hesabında əks olunur. Dəyərin dəyişilməsi hesabları və həcmin dəyişilməsi hesabları ilin sonunda aktivlərin xalis dəyəri hesabı ilə bağlanan nəticə hesablarına aid edilir. Dəyər və həcmin dəyişilməsi hesabları konkret aktiv və öhdəliklərin qiymətləndirilməsi üçün istifadə edilir.

Balans hesabları "yığım hesabları" olub, növbəti maliyyə ilinə keçdikdə həmin hesabların son qalığı özlərinə aid edilir. Balans hesablarına qeyri-maliyyə aktivlərinin uçotu hesabı, maliyyə aktivləri, maliyyə öhdəlikləri, nəticə hesablarının bağlanması hesabı, aktivlərin xalis dəyəri hesabı daxildir. Bu hesablarda ilk və son qalıqlar, həmçinin, bütün əməliyyatlar üzrə dövriyyələr öz əksini tapır.

Göründüyü kimi, XİİS-də hesablar planı faktiki olaraq ictimai sektor üçün mühasibat uçotunun beynəlxalq standartları (İSBMUS) və hökumətlər üzrə statistik hesabatlar sisteminin (Dövlət Maliyyə Statistikası (DMS)) tələblərinə tamamilə uyğundur və onların əsasında yaradılmışdır. Lakin ölkəmizdə Hesablama Palatasının verdiyi rəydə ifadə edilir ki, Milli Hesablar Sisteminin Dövlət Maliyyə Statistikası ilə uzlaşdırılmanın əsasını təmin edən Vahid Büdcə Təsnifatı ilə uyğunluq təşkil etməməsi büdcənin təhlilinində çətinliklər yaradır. Ona görə də ilkin olaraq büdcə təsnifatının Dövlət Maliyyə Statistikası (DMS) ilə tam uzlaşmasına nail olunmalıdır.

Azərbaycanda XİİS-in tətbiqi konkret olaraq aşağıdakı üstünlükləri yaratmışdır:

--- dövlət üçün hərtərəfli şəkildə maliyyə hesabatlarının hazırlanmasına nail olundu;

--- Maliyyə Nazirliyi daxilində və digər nazirliklərlə məlumat bazasında maliyyə və büdcə məlumatlarına inteqrasiya əldə edildi;

--- mühasibat uçotu və hesabatlılıq üzrə beynəlxalq standartların (İSBMUS/DMS) tələblərinə cavab verən bir sistemin təşkili təmin edildi;

--- kassa idarəetməsinin yüksəldilməsi, likvidliyin təmin olunması, proqnozlaşdırılma və planlaşdırmanın yüksək səviyyədə təşkilinə nail olundu ;

--- Mərkəzi Bank vasitəsilə mərkəzləşdirilmiş maliyyə vəsaitlərinin ödəmə sisteminin icra olunması və Mərkəzi Bankla real vaxt rejimində (şəbəkə vasitəsilə) uzlaşma yaradılması mümkün oldu;

--- Gömrük Komitəsi və Vergilər Nazirliyinin gəlir məlumatlarının əhatəli bir şəkildə XİİS-ə inteqrasiyasına nail olunmuşdur;

--- Hesablama Palatası və ya audit təşkilatı kimi fəaliyyət göstərən digər qurum tərəfindən bütün maliyyə razılaşmalarının yoxlanılması üçün imkan yaradılmışdır;

--- bütün xərclərinin büdcəyə müvafiq olunması təmin edilmiş, öhdəlik, mal alışı və sifariş sənədinin reallaşdırılması, kreditor borcunun ödənilməsi və avans ödənişlərin aparılması avtomatlaşmış rejimdə işlənilir.

Beləliklə, XİİS Azərbaycan Respublikasının dövlət büdcəsinin sistematik icrasını, kassa və dövlət xərclərinin idarə edilməsini tamamilə asanlaşdırmışdır.

**Nəticə.** Yeni mexanizmlərin, yeni yanaşmaların tətbiqi büdcə menecmentində ciddi dəyişikliklərin baş verməsinə gətirib çıxaracaqdır. Burada ən əsas dəyişiklik ondan ibarət olacaqdır ki, büdcə çərçivəsində vəsaitlər həm təyinatı ilə istifadə olunmalıdır, eyni zamanda həm də həmin vəsaitlərdən istifadə artıq ciddi nəticə və sosial səmərənin əldə olunması ilə müşahidə edilməlidir. Yeni yanaşma nəticəsində büdcə qanunvericiliyinin tərkibinə daxil olan bəzi sənədlərdə də dəyişikliklər aparılmalıdır. Ölkəmizdə proqram-məqsədli metodun tətbiq edilməsi üçün vahid büdcə təsnifatında ayrıca proqram təsnifatının yaradılması labüddür. Proqram təsnifatının yaradılması ilə burada digər təsnifatlara nisbətən (funksional,iqtisadi) prioritetliyə malik olan təsnifat kimi məhz proqram təsnifat çıxış edəcəkdir. Proqram əsaslı büdcələşmə ilə artıq birmənalı şəkildə müzakirə və debatlar xərc maddələri ətrafında deyil, proqramlarda qarşıya qoyulan konkret və qiymətləndirilə bilən məqsədlər ətrafında aparılacaqdır. Nəticəəsaslı büdcə mexanizminin tətbiqi, xüsusən büdcə sistemi üzrə büdcə planlaşdırılmasında, büdcə uçotu, hesabatlılığın təmin edilməsində ciddi dəyişikliklərin yaranmasına səbəb ola bilər. Maliyyə Nazirliyi bu mexanizmə keçidi tam təmin edərsə, onun tərkib hissəsində vacib rol oynayan xəzinədarlıq yeni funksiyalar yerinə yetirə bilər ki, bu funksiyalar həm büdcənin icrasında nəzarəti gücləndirə bilər, həm də büdcənin icrası zamanı proqramlar üzrə səmərəli nəticələrin alınmasına şərait yarada bilər.

## Ədəbiyyat


1. “Büdcə sistemi haqqında” Azərbaycan Respublikasının Qanunu (2 iyul 2002-ci il).
2. Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarix Fərmanı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi”.
3. Azərbaycan Respublikası Maliyyə Nazirliyinin 13 fevral 2013-cü il tarixli İ-25№-li Əmri ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında Xəzinədarlığın İdarəedilməsinin İnformasiya Sisteminə (XİİS-ə) keçid dövrü üçün metodik göstərişlər”, Bakı-2013.
4. «Бюджетирование, ориентированное на результат» / И.А. Азизова. – Ташкент, 2010. – 144 с.
5. Белев С.Г., Дешко М.А., Минеев А.Н., Могучев Н.С., Тищенко Т.В, Худько Е.В, Хрусталев А.А, «Международный опыт включения долгосрочных целевых программ в бюджетный процесс», Москва 2015.
6. “Среднесрочное бюджетное планирование” - Ё.Ш. Файзуллаев, И.А.Азизова, - Ташкент, 2010 - 148 с.

7. Давыдова, Л.В. Методологические основы обоснования программного бюджета региона / Л.В.Давыдова, Т.Ю. Ткачева // Финансы и кредит. - 2016. №23. - с. 36-49.
8. Babazadə İ.V. Büdcə xərclərinin səmərəliliyinə dair müasir elmi-nəzəri yanaşmalar, AMEA İqtisadiyyat İnstitutu, "Elmi əsərlər" toplusu, Bakı, 2018, №1.
9. Dövlət büdcəsinin layihəsi və icrası haqqında Hesablama Palatasının rəyləri, http://sai.gov.az
10. Budget.az
11. Pempal.org
12. http://Maliyye.gov.az

**Rəyçi: dos. D.Məmmədova**

Göndərilib: 04.08.2020 Qəbul edilib: 06.08.2020

DOI: 10.36719/AEM/2007-2020/57/117-120

**Ayan Uğur qızı Abbasova**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
ayna20239@gmail.com

# BƏRK MƏİŞƏT TULLANTILARI ƏSASINDA MAYE KOMPOSTLARIN ALINMASI

**Xülasə**

Dövrümüzün əsas problemlərindən biri bərk məişət tullantılarının - bərk məişət tullantılarının atılması və emalıdır. Ölkəmizdə bu sahədə köklü dəyişikliklər barədə danışmaq hələ çətindir. Avropa ölkələrinə və ABŞ-a gəldikdə, oradakı insanlar çoxdan belə qənaətə gəldilər ki, bərk tullantıların resurs potensialı məhv edilməməli, istifadə olunmalıdır. Bərk tullantı probleminə zibillə mübarizə olaraq yaxınlaşa bilməzsən, nəyin bahasına olursa olsun ondan qurtarmaq vəzifəsi qoyursan. Qərbi Avropa şəhərlərinin küçələrində zibilin selektiv toplanması üçün çox rəngli qabların (şüşə, tullantı kağızları və s.) Qurulması heç kimə xəbər deyil. Eyni zamanda, ümumi mənfəət nəzərə alınmaqla tərəflərin vəzifələri və vəzifələri aydın şəkildə bölünür. Demək olar ki, bütün ölkələrdə yeməyin çürüməyən plastik qabıqda satılması qadağandır. ABŞ-da 1998-ci ildə, məsələn, Amerikanın Geri Çevrilmə Günü keçirildi. Ən təsirli iştirak üçün mükafat tamamilə təkrar materiallardan hazırlanmış 200.000 dollar dəyərində bir ev oldu. 1990-cı ildən bəri, İngiltərə hökuməti pan-Avropa direktivlərini tətbiq edir: ən azı 70% ərzaq səviyyəli plastik qablar (şüşələr, eynəklər, çantalar, blister paketlər və s.) Təkrar emal edilməlidir.

***Açar sözlər:*** *məişət tullantıları, sanitar-gigiyena tələbləri, maye tullantıları, təkrar emalın əhəmiyyəti, sənaye-məişət tullantıları*

## Purchase of lıquıd composts on the basıs of solıd household waste

**Summary**

One of the main problems of our time is the disposal and processing of solid waste - solid waste. It is still difficult to talk about radical changes in this area in our country. As for European countries and the United States, people there have long come to the conclusion that the resource potential of solid waste should not be destroyed, but used. You can't approach the problem of solid waste as a garbage fight, you set a task to get rid of it at any cost. Nobody knows about the installation of multi-colored containers (glass, waste paper, etc.) for the selective collection of garbage on the streets of Western European cities. At the same time, the duties and responsibilities of the parties are clearly divided, taking into account the common benefit. In almost all countries, the sale of food in non-perishable plastic packaging is prohibited. In the United States in 1998, for example, America's Recovery Day was celebrated. The prize for the most effective participation was a $ 200,000 house made entirely of recycled materials. Since 1990, the British government has been implementing pan-European directives: at least 70% of food-grade plastic containers (bottles, glasses, bags, blister packs, etc.) must be recycled.

***Key words:*** *household waste, sanitary-hygienic requirements, liquid waste, importance of recycling, industrial-household waste*

## Giriş

Dünya əhalisinin fasiləsiz olaraq artması və nəticədə məişət tullantılarının ətraf təbii mühitə kortəbii və ya düşünülmüş şəkildə atılması, onların qiymətləndirilməsini və təbiətə zərər gətirməyəcək şəkildə kompleks emalı məsələsini daha da aktual edir. Hal-hazırda tullantıların (istehsal, tibbi, radioaktiv, tikinti və s.), xüsusilə məişət tullantılarının düzgün iqtisadi qiymətləndirilməsi, ekoloji tarazlıq nəzərə alınaraq idarə edilməsi ciddi ekoloji problemlər arasındadır və beynəlxalq səviyyədə bu məsələyə baxılır. Əgər düzgün şəkildə səmərəliliyi dəyərləndirilərsə, məişət tullantıları həm xammal kimi qiymətləndirilərək iqtisadi inkişafa səbəb olar həm də ətraf təbii mühiti tullantının yaratdığı dönülməz ekoloji kadastrlardan (basdırılma zamanı torpaqlar məhv olur, təbiətdə yığılaraq epidemik xəstəliklər çoxalır, sulara atılaraq hidrosferdə canlıların ölümünə səbəb olur, kortəbii yandırılaraq dioksin maddəsinin ətraf təbii mühitə yayılmasına səbəb olur və s.) qismən də olsa qoruyar. Bu kimi səbəblərdən məişət tullantılarının qiymətləndirilməsi, kompleks emalının tətbiqi, emalı metodlarının innovativ üsullarının kəşfi, tətbiqi, tullantıların idarə edilməsinin nəinki inkişaf etmiş, həmçinin inkişafda olan ölkələrdə təşkili yalnız ətraf təbii mühitə və ya ölkənin inkişafı üçün deyil, canlı orqanizmlər o cümlədən insanların sağlamlığı üçün mütləqdir və bu baxımdan mühüm əhəmiyyət kəsb edir. Məlumdur ki, məişət tullantıları (bərk məişət tullantıları və məişət-fekal suları) ictimai fəaliyyətdə əmələ gələn, iqtisadi dəyəri yüksək olan, lakin ətraf mühitdə yığılarsa ciddi təhlükələr doğuran, məişətdə

yararsız hesab edilən artıq maddələrdir. Məişət tullantıları bir tərəfdən insan sağlamlığına zərəri olmaqla yanaşı təbii mühiti çirkləndirir, amma sənaye üçün də güclü xammal resursudur.

Məişət tullantıları haqqında Azərbaycan Respublikasının Qanunu, Azərbaycan Respublikasının Prezidentinin ətraf təbii mühitin yaxşılaşdırılmasına dair sərəncamları nəzərə alınmışdır.

| **İqtisadi-ekoloji qiymətləndirilməsi araşdırılmış və elmi yeniliyi müəyyən edən əsas nəticələr aşağıda göstərilmişdir:** |
| --- |
| -məişət tullantılarının həcmi, xüsusiyyətlərinin təyini; |
| - kommunal-məişət tullantıların emalının vacibliyi; |
| - yalnız bərk məişət tullantılarının deyil, eyni zamanda məişətdə yaranan maye halında tullantı sularının düzgün qiymətləndirilərsə təkrar istifadəsinin mümkünlüyü; |
| -Azərbaycanda və digər ölkələrdə emalı metodlarının araşdırılması; |
| -Optimallaşdırılması istiqamətində tullantıların idarə edilməsinin prioritet istiqamətlə |

Məişət tullantıları və ya istehlak tullantıları - dedikdə evlərdən, bağça, park və gəzinti sahələri kimi ictimaiyyətə açıq yerlərdən, sənaye müəssisələrindən, iş yerlərindən atılan, lakin təhlükəli olmayan tullantılar (işçilər nahar edərkən yaranan qida qalıqları, kağız, plastik butulkalar və s.), o cümlədən məişətdə istifadə olunan tibbi tullantılar (radioaktiv və təhlükəli olanlar istisna olmaqla) aiddir ki, çox qismi bərk, az hissəsi maye və ya yarım bərk, bir də təhlükəli olaraq təsnif olunur. Gündəlik fəaliyyət nəticəsində ev mühitində yarana biləcək təhlükəli və zərərli xüsusiyyət daşımayan hər cür tullantı bərk məişət tullantılarıdır. Yemək qalıqları, ev əşyası tullantıları, qablaşdırma materialları (şüşələr, kağız, karton, tənəkə qutular), yanacaq tullantıları (kül) bu kateqoriyaya aiddir. Bir də qalıq və ya artıq tullantılar vardır ki, onlarda tullantıların emal prosesinə yararlı olmayan, çeşidlənməyən və yenidən emal oluna bilməyən məişət materialların əsasında yaranır. Evdə su hamam, mətbəx, tualet və bağça (həyət) olmaq üzrə dörd yerdə istifadə edilməkdədir. Məişətdə ən çox istehlak olunan maye sudur. Bundan əlavə maye yağlar, paltar suyu, duz turşusu, maye sabun, şampun və s. -dən istifadə mayelər arasındadır ki, maye məişət tullantılara aiddir. Bir də təhlükəli məişət tullantıları vardır ki, bura tibbi təhlükəli (istifadə olunmuş iynə qabları, açılmış sarğı vasitələri, dərmanlar və s.), radioaktiv olan və ya olmayan digər təhlükəli tullantılar (boş batareya, elektron avadanlıqları, məişət texnikası, boyalar, aerozol balonları və s.) aiddir.

Cəmiyyətin fəaliyyət dairəsi genişləndikcə, maddi nemətlərin istehsalı və uyğun olaraq tullantıların həcmi də artır. Ümumiyyətlə nəinki məişət tullantıları, bütövlükdə tullantıların həcmi durmadan artır, bu səbəbdən hər bir ölkədə o cümlədən Azərbaycanda onların təkrar emalı, mövcud emal metodlarının inkişaf etdirilməsi, yeni üsullarının icad edilməsi tullantısız texnologiyanın, mövcud tullantının yox edilməsi, digər ölkələrin təcrübələri nəzərə alınmaqla tətbiqi vacib və prioritet istiqamət kimi qiymətləndirilməlidir.

**Məişət tullantıları:**



Tullantıların inteqrə olunmuş şəkildə idarə edilməsi, xüsusi ilə məişət tullantılarının ekoloji dəyərləndirilməsi, iqtisadi qiymətləndirilməsi, texnoloji proseslərin öyrənilməsi digər ölkələrdə olduğu kimi, Azərbaycanda da bu məsələyə ciddi baxılır və makroiqtisadiyyatımızın inkişafı üçün vacib rol olduğu bəllidir. Azərbaycan Respublikası Prezidentinin 2006-cı il 28 sentyabr tarixli sərəncamı ilə təsdiq edilmiş Azərbaycan Respublikasında ekoloji vəziyyətin yaxşılaşdırılmasına dair 2006-2010-cü illər üçün kompleks tədbirlər planına əsasən Bakı və şəhərətrafı digər yaşayış məntəqələrində yaranan bərk məişət tullantılarının utilizasiyasına və ölkədə təkrar istehsal biznesinin inkişafına kömək məqsədilə Bərk Məişət Tullantılarının Çeşidlənməsi Zavodu və Bərk Məişət Tullantılarının Yandırılması zavodu (Zavodun layihələndirilməsi, tikintisi və istismarı bütünlüklə Fransanın "Constructions Industrielles de la Méditerranée S.A." -"CNİM" S.A. şirkəti tərəfindən həyata keçirilib) 19 dekabr 2012-ci il tarixində Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən tam istismara verilmişdir.

Məlumdur ki, istehlak tullantılarının emalı prosesi müxtəlif metodlardan ibarətdir. Söhbət Azərbaycandan gedirsə bu sahə yenidir və bərk məişət tullantılarının düzgün qiymətləndirilərək idarə edilməsi, istifadə edilməsi yalnız paytaxtda Təmiz Şəhər ASC məşğul olur. Paytaxtda məişət tullantılarının emalının texnoloji metodları əsasən alman texnologiyasına əsaslanır, çünki bu sahə üzrə Avropada lider Almaniyadır. Bərk məişət tullantılarının işlənməsinin metodlarının ümumilikdə təsviri:




Qrafikdə qeyd edildiyi kimi çeşidlənmə, termik işlənmə əsasən texnoloji metodlara, biotermik və fermentasiya isə ekoloji və ya bioloji mteodlara aiddir. Yuxarıda qeyd olunduğu kimi, paytaxtda məişət tullantılarının texnoloji metodla emalını həyata keçirən Təmiz Şəhər ASC-dir. Texnoloji metodla emalın növləri çeşidlənmə, yandırılma, poliqona göndərilmədir və bir-biri ilə sıx əlaqəlidir. Emal prosesinin birinci mərhələsi yəni çeşidlənmə, Bərk Məişət Tullantılarının Çeşidlənməsi Zavodunda (zavod Balaxanıda yerləşir, yaxın gələcəkdə Bakının kəndlərindən biri olan Şüvəlanda və Qaradağda da çeşidlənmə zavodu fəaliyyət göstərəcək) həyata keçirilir, bura daxil olan məişət tullantıları çeşidlənir və təkrar emala yararlı olan tullantılar sortlaşdırılaraq, sifariş edən yerli emal şirkətlərinə (Green Baku, Coca cola və s.) göndərilir. Emala yararlı olmayan tullantılar isə təhlükəlilik dərəcəsi və digər fiziki xüsusiyyətləri nəzərə alınaraq müəyyən yerlərə çatdırılır.

Beton bunkerlərdə tullantılar ilkin çeşidlənmə aparılır, böyük ölçülü materiallar ayrılır, digər tullantılar isə yükləyici ilə zavodun daxilinə aparılır. Nəzərə alsaq ki, zibil maşınında gətirilən tullantıların 40%dən çoxu plastik torbalarda zavoda gətirilmir, çünki keyfiyyətinin aşağı olması və ya digər səbəblərdən cırılmış şəkildə gəlir, lakin məişət tullantıları arasında açılmamış plastik torbalar olur ki, mütləqdir ki, çeşidlənməyə getməmiş torba açan mərhələsindən keçsin. Digər texnoloji metod isə termik üsul olan yandırılmadır ki, bu işi Bərk Məişət Tullantılarının Yandırılması zavodu həyata keçirir. Bu metod bahalı olsa da, ətraf mühitin keyfiyyətinin yaxşılaşdırılması, poliqonlarda tullantıların sayının artmasının (basdırılma ən ucuz və ən zərərli metodlardan biridir) qarşısının alınması baxımından çox sərfəlidir. Avropa ölkələrində çeşidlənmə kimi problem olmadığı üçün, tullantıların idarə edilməsində əsas yeri kompostlama (biotermik) və yandırılma (termik) metodları tutur.

Çeşidlənmə zavodundan fərqli olaraq, Yandırılma zavodunda əsasən avtomatlaşdırılmış iş mühitidir (idarə pultları ilə) və əl əməyi demək olar ki, çox azdır. Zavodu ən son (4G) texnologiya ilə inşa olunub. Burada proses çeşidləmədən daha sadədir yəni, tullantı zibil maşınları ilə gətirilir, (iki xətt üzrə fəaliyyət göstərir -"marten sobaları və boyler") böyük həcmli bunkerlərə yığılır, xüsusi qaldırıcı kranla (bir dəfəyə 5 ton tullantı qaldırır, əgər

tullantıların içərisində dəmir kimi ağırlıq gətirəcək tullantı olmasa bu rəqəm 8-ə qədər qalxa bilir) qaldırılıb bunkerin sol tərəfində yerləşən marten sobalarına (2 ədəd) göndərilir, marten sobalarından (temperatur 850 dərəcə olur) aşağıda xüsusi qurğular var ki, ora burada yanan tullantıların dib külü (bottom ash) yığılır ki, sonradan bu küldən asfaltın çəkilməsində, tikinti işlərində təkrar istifadə olunur. Marten sobalarından sonra, bəzi tullantılarda müəyyən proseslərin getməsi üçün buxar istehsal edən borucuğ və ya boylerə atılır, əmələ gələn buxardan (borucuqda yerləşən su qızdırılaraq buxara çevrilir) elektrik enerjisi əldə olunur.

Paytaxt Bakıda Balaxanı Bərk Məişət tullantılarının Zərərsizləşdirilməsi Poliqonunda tətqiqatıma əsasən qeyd etmək olar ki, hər iki metodun tətbiqi burada həyata keçirilir. Belə ki, poliqonun üzəridə müəyyən hücrələr qoyulub ki, tullantıdan əmələ gələn metan qazını tutsun və elektrik enerjisinə çevirsin. Digər poliqon texnologiyası isə ərazidə qoyulmuş su təmizləyici qurğusudur ki, bunun sayəsində sızıntı suyu qrunt sularına, torpağa qarışmamış tutulur, yığılır və qurğuya göndərilir ki, nəticədə içməyə tam yararlı olmasa da texniki (poliqonun ərazisindəki ağacları sulamaq, hər iki zavodu [Bərk Məişət Tullantılarının Çeşidlənməsi, Bərk Məişət Tullantılarının Yandırılması], kanalizasiya məqsədləri üçün) su kimi istifadə etmək olur.

Bundan əlavə tullantıların texnoloji qiymətləndirilməsi baxımından elmi yenilik kimi təklif edirəm ki, Bərk Məişət Tullantılarının İdarə edilməsi üzrə Azərbaycana Pellet sobaları gətirilsin. Bu sobalar yanmaya yararlı olan tullantıları yandırmadan emal edən, tullantıdan istilik əldə olunması baxımından çox sərfəlidir. Belə ki, pellet sobaları, fiziki və kimyəvi zərərlərdən azad olmuş tullantıları (məişət) qurudaraq, kiçik hissəciklər halına (fuel pellet) çevirir və istilik enerjisi kimi istifadə olunur. Bərk məişət tullantılarının aradan qaldırılması maye və qaz halında olanların aradan qaldırılması, bərpası, emal metodları nisbətən fərqlidir. Bərk məişət tullantlarının çeşidi çoxdur və bioloji parçalanması daha çətin olandır. Bərk məişət tullantılarının azaldılması, təsirinin azaldılması istiqamətinə təkrar emalı ona ən uyğun həll istiqamətlərindən biridir.

## Nəticə

Sonda belə nəticəyə gəlmək olar ki, Azərbaycanda məişət tullantılarının düzgün dəyərləndirilməsi aparılarsa (qida tullantılarından gübrə almaq, poliqona basdırmamaq və s.) bioqaz istehsalı üzrə ekoloji bazarda bizim də payımız olar. Xüsusilə qeyd etməliyəm ki, poliqonda basdırılan biotullantılardan bioqazın alınması, ölkə üçün perspektivli sahədir.

Nəzərə alsaq ki, qeyri-neft sektorunun inkişafı baxımından müəyyən işlər görülür, bu səbəbdən bölgələrdəki, qida tullantılarından gübrə əldə edərək, kənd təsərrüfatının inkişafına təkan vermiş olarıq. Azərbaycanda məişət tullantılarının qiymətləndirilməsi yalnız paytaxt daxilində həyata keçirilir. Bu prosesə Bərk Məişət Tullantılarının Yandırılması Zavodu, Bərk Məişət Tullantılarının Çeşidlənməsi Zavodu və Balaxanı Şəhər Tullantılarının Zərərsizləşdirmə Poliqonu aiddir. İnzibati-iqtisadi rayonlarda çeşidləmə, yandırılma, kompostlama proseslərini həyta keçirən zavodlar inşa olunsun. Əhali arasında məişət tullantılarının çeşidlənməsinin vacibliyi haqqında ekoloji maarifləndirmə tədbirləri həyata keçirilməlidir. Xüsusilə yay aylarında, nəzərə alsaq ki, isti mövsümlərdə qarpız-yemişin qalıqları kağız tullantılarla eyni qaba atılır, bu zaman təkrar emala yararlı olan məhsulların effektivliyi itir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasında ətraf mühitin mühafizəsi - Azərbaycanın statistik göstəricisi - Bakı 2003
2. Azərbaycan Respublikasının Ekoloji cəhətdən dayanıqlı sosial-iqtisadi inkişafa dair Milli proqramı - Ekologiya və Təbii Sərvətlər Nazirliyi - Bakı 2002
3. Azərbaycan Respublikasının ətraf mühitə dair qanunvericilik toplusu - Ekologiya və Təbii Sərvətlər Nazirliyi - Bakı 2002
4. Əliyev A., Əliyev T. - Bərk məişət tullantılarının idarə olunmasına dair terminlərin və anlayışların izahlı lüğəti - Azərbaycan Respublikası Prezidenti yanında Qeyri-Hökumət Təşkilatı Sosial iqtisadi araşdırmalar İctimai Birliyi - Bakı 2012
5. Biddlestone, A.J., Gray, K.R. and Day, C.A. (1987) In Environmental Biotechnology, Ellis Horwood, Chichester
6. Chilton M., “WTE Worldwide”, Waste Management World, Nov-Dec 2008, 4749, 2008.
7. Гасанова А.А. Экологические проблемы городов Азербайджана. Баку: “Элм”, 2003, 320 с
8. Фатуллаев Ш.С. Градостроительство Азербайджана XIX начала XX веков, Москва: Стройиздат, 1986, 303 с.

**Rəyçi: dos.N. Salmanova**

Göndərilib: 29.08.2020 Qəbul edilib: 30.08.2020

## JURNALIN İÇİNDƏKİLƏR:

### HUMANİTAR VƏ SOSİAL ELMLƏR HUMANITIES AND SOCIAL SCIENCES

www.aem.az AEM AZ EN TR RU

# "ELMİ İŞ"

**beynəlxalq elmi jurnal**

Jurnalda aşağıdakı sahələr üzrə məqalələr dərc edilir:

- Tarix və antropologiya
- Filologiya
- Hüquq elmləri
- Fəlsəfə və sosiologiya
- Siyasi elmlər
- Psixologiya
- Pedaqogika
- Sənətşünaslıq və memarlıq

Məqalələr Azərbaycan, ingilis, türk və rus dillərində qəbul olunur.

**Jurnalda məqalələrin dərc olunması ödənişlidir**

**Məqalələrin texniki tərtibatına dair tələblər**

**Məqalələrin həcmi:** 8-25 səhifə

- Məqalələr A4 formatda 14 ölçüdə, 1.5 sətirlərarası intervalla, Times New Roman şrifti ilə yazılmalı, kənarlardan 2 sm (hər tərəfdən) boşluq buraxılmalıdır.
- Məqalədə müəllifin adı, atasının adı və soyadı (məs.: Əli Məmməd oğlu Vəliyev), iş yeri (tam şəkildə), ölkə və şəhər, müəllifin şəxsi elektron ünvanı və telefon nömrəsi (məqalənin başlığından əvvəl sağ tərəfdə) göstərilməlidir.
- Məqalədə **Giriş** və **Nəticə** hissələri yazılmalıdır
- Məqalənin əvvəlində məqalənin yazıldığı dildə və ingilis dilində 7-8 cümədən ibarət **Xülasə** və **açar sözlər** (5 sözdən az olmayaraq) yazılmalıdır. Əgər məqalə ingilis dilindədirsə, o zaman xülasə və açar sözlər ingilis və Azərbaycan dilində yazılmalıdır.
- Məqalənin sonunda **Ədəbiyyat** yazılaraq məqalədə istifadə olunan ədəbiyyatın siyahısı verilməlidir. Siyahıda əsərlərin ardıcıllığı istinad ardıcıllığına uyğun verilməlidir.
- **İstinadlar** mətnin içərisində aşağıdakı qaydada yazılmalıdır:

Mətndə mənbənin (fikrin) müəllifi göstərilmədikdə

Müəllifin soyadı - vergül - interval, mənbənin nəşr ili - iki nöqtə - interval - səh. ***Nümunə***: Axundov, 2005: 201)

Əgər müəllifin adı mətndə çəkilirsə o zaman bu qaydada yazılmalıdır: "...A.Axundov (2005: 205) qeyd etmişdir ki..."

**Redaksiya ünvanı:** Bakı ş., Mətbuat pros., 529,
"Azərbaycan" Nəşriyyatı, 6-cı mərtəbə.
www.aem.az saytında məqalələr onlayn yerləşdirilir.
E-mail: elmmerkezi@gmail.com
Tel.: +994 (012) 510 63 99
+994 (050) 209 59 68
+994 (055) 209 59 68

